Əli Əliyev

# Laçın – Qədim Oğuz Yurdu

## (Zəngəzurun Mağoğuz bölgəsi üzrə Hacısamlı bəyliyi və bir nəsilin səcərəsi)

Bakı -2009

*Elmi redaktor:* **Xaqani Məmmədov,** tarix elmləri doktoru, professor
*Redaktor:* **Mübariz Binnətoğlu**
*Rəyçilər:* **Tahir Kərimli,** pedaqoji elmlər namizədi
**Əlizadə Nəcəfov,** tarix elmləri namizədi

**Az-2**
**Ə-51**

Ə $\frac{8032-2009}{8032-2009}$ qrifli nəşr

"Avropa" nəşriyyatı

# GİRİŞ

Qarabağ ilk insan məskəni olan ən qədim diyar və yeraltı, yerüstü sərvəti ilə daimi diqqəti cəlb edən cənnət guşəsidir. Bu gün dilimizdə işlənən və Qarabağın aranında, dağında özünü qoruyub saxlayan, bu günümüzü qədim anlam və zamanlara bağlayan onomastik vahidlər bir daha sübut edir ki, bu diyar Azərbaycanın ən qədim yaşayış məskənidir. Məsələn, Aran, Qor, Qazan, Beyləqan, Bərdə, Ərsax, Qarqar, Kür, Həkəri və s. sözlər bu diyarın anlamını e.ə. olan dövrlərə aparıb çıxarır.

Qarabağ diyarı daimi olaraq mübarizələr meydanı olmuş, çox hücumlara sinə gərmiş, çox düşmənləri tarixin səhifəsindən silmiş, talanqarət olunsa da, illərin sınağından alnıaçıq, üzüağ çıxmışdır. Lakin son dövrdə məkrli düşmənin uzunmüddətli hazırlığı sayəsində Qarabağı ermənilər zəbt etdilər. Külli-miqdarda maddi və mədəniyyət abidələrimizi, şəhər və kəndlərimizi yandırdılar. Biz ermənilərin iyrənc xüsusiyyətlərini lap qədimdən bilirik. Moisey Kalankatuklunun «Albaniya tarixi» əsərini ermənilər nə qədər dəyişikliyə uğratsalar da tarixi həqiqətləri silə bilməmiş, öz iç üzlərini ört-basdır edə bilməmişlər.

Mərhum akademik Ziya Bünyadovun zəhməti sayəsində həmin əsər Azərbaycan dilinə tərcümə edilib 1993-cü ildə nəşr olunmuşdur. Həmin əsərdə belə qeyd olunur: «Erməni katolikosluğu və nahararlarının mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçıların köməyinə əl atır, «Xaç bayrağ»ı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi Qarabağ (Arsax) xalqlarını yox edirdi». (11, 227)

Buradan aydın olur ki, Qarabağın məhvinə IV-V əsrlərdən çalışan ermənilər uzun illərdən sonra tam nail oldular.

Ümumiyyətlə, Qarabağ haqqında öyrənilən hər hansı bir bilgi Qarabağşünaslıq üçün atılmış önəmli bir iş sayılmalıdır. Odur ki, burada Qarabağ və onun hüdudları, aranı və dağı haqqında bəzi məlumatları diqqətə çatdırmağı vacib bildik.

Hacısamlı bəyliyindən əvvəl Zəngəzur mahalında kiçik də olsa Bərguşad xanlığı olubdu. Kiçik Bərguşad xanlığı Gəncə bəylərbəyliyinə tabe imiş. Həmçinin bu dövrdə Dizaq, Vərəndə, Xaçın, Çiləbörd və Talış məlikliyi Qarabağda Nadir şahın ölümünə qədər Gəncə bəylərbəyliyinə tabe imiş.

Qarabağın mərkəzi əvvəl Bərdə, sonra Beyləqan, Səfəvilər dövründə Gəncə, xanlıq dövründə isə Şuşa şəhəri olmuşdur. Hətta Qarabağ adında şəhər də olmuşdur. «Qarabağnamələrin II cildində mərhum professor N.F.Axundov yazmışdır:

«...Qarabağ şəhəri ən azı min il mövcud olmuş və XVIII əsrdə süqut etmişdir». (9, I cild, 108)

Qarabağın sərhədlərini də «Qarabağnamələr»dən öyrənə bilirik. Mirzə Camal Cavanşir «Qarabağ tarixi» əsərində yazmışdır:

«Qədim tarix kitablarının yazdığına görə Qarabağ vilayətinin sərhəddi belədir: Cənub tərəfdən Xudafərin körpüsündən Sınıq körpüyə qədər-Araz çayıdır.......

Şərq tərəfdən Kür çayıdır ki, Cavad kəndində Araz çayına qovuşaraq gedib Xəzər dənizinə tökülür.

Şimal tərəfdən Qarabağın Yelizavetpolla,sərhədi Kür çayına qədər-Goran çayıdır və Kür çayı çox yerdən (keçib) Araz çayına çatır.

Qərb tərəfdən Küşbək, Salvartı və Ərikli adlanan uca Qarabağ dağlarıdır». (9, II cild, 417)

Burada diqqəti Ərikli adlanan Qarabağ dağlarına cəlb etmək maraqlıdır. Ilk baxışda Ərikli dağları dedikdə Laçın rayonunun Ərikli kəndi ətrafında olan dağlar nəzərdə tutula bilər. Lakin bu belə deyildir. Ərikli dağları Sisian rayonunu Ermənistandan ayıran sıra sərhəd dağlarıdır. Ərikli kəndi də Sisian rayonunda olmuşdur. Bütün əhalisi azərbaycanlılardan ibarət olduğuna görə ermənilər həmin kəndin əhalisini pərən-pərən salmış və kəndi yandırmışlar.(19,70) Laçın rayonunun Ərikli kəndi də həmin kəndin adını yaşadır. Sisiandan gəlmiş Əriklilər az bir tayfa olmuş və çoxluq içərisində ərimişlər.

Çünki bu kəndin əhalisi Qaraqasımlı tayfasındandır. Bu barədə sonra məlumat verəcəyik. Əsas məqsədimiz Laçın rayonu və bu əraziyə daxil olan Hacısamlı bəyliyi, onun tarixi, müəyyən adların şərhi, bir nəslin şəcərəsini vermək və s. bu kimi bəzi məsələlərin izahına və tarixi faktlarla aşkarlanmasına çalışmaqdır.

# Laçın – qədim Oğuz yurdu.

**Dünənimiz, bu günümüz və sabaha ümidimiz.**

XX əsrin dünya liderlərinin birincisi Azərbaycan xalqının ulu öndəri, dövlətçilik sahəsində dünya araenasında imzası olan və siyasi kursu ilə böyük, əzəmətli bir məktəb yaradan H.Ə.Əliyev Azərbaycanda hakimiyyətə gəldiyi gündən etibarən vətənimiz inkişaf edib çiçəklənmişdir. Vətənimizin bir parçası olan Laçın rayonu da 1969-cu ildən sonra inkişaf etmişdir. Bu ildən etibarən rayonun sosial-iqtisadi və mədəni həyatında inqilab baş verdi.

Azərbayjan KP MK-nın və Respublika Nazirlər Sovetinin «Dağ rayonlarının iqtisadiyyatını daha da yüksəltmək barədə», «Laçın rayonu zəhmətkeşlərinə mədəni-məişət xidmətini daha da yaxşılaşdırmaq tədbirləri haqqında» (16 noyabr 1971), «Laçın şəhərinin **50** illiyi barədə» qərarları keçmiş tariximiz olsa da fəxrlə anılan günlərimizdir. O günlərdə Laçın rayonunda 100-dən çox ümumtəhsil məktəbi, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 1 qiyabi orta, 1 orta texniki peşə məktəbi və Bakı 1 saylı Tibb Texnikumunun filialı fəaliyyət göstərmişdir. Həmçinin rayonda 217 mədəniyyət müəssisələri, 30 rabitə, 100-dən artıq tarixi abidə, 42 səhiyyə ocağı, 460 ticarət və ictimai – iaşə, 36 çörəkxana və s. onlarla kommunal xidməti müəssisələri fəaliyyət göstərmişlər. Bütün bunlar Laçının dünənki durumudur. Bu gün Laçın rayonu işğal altında olsa da bütün laçınlılar Laçına qayıtmaq arzusu ilə Laçını yaşadırlar.

Ulu öndərimiz H.Ə.Əliyevin siyasi xəttinin davamçısı sevimli prezidentimiz İ.H.Əliyev bü gün bizim ümid yerimiz, xalqımızı xoşbəxtliyə qovuşdura biləcək arzu və diləyimizdir. Onun uğurlu siyasəti və dönməz iradəsi sayəsində biz doğma diyarımıza, unudulmaz Laçınımıza qayıdacağıq.

Laçın rayonu Qarabağın dağlıq ərazisinin bir hissəsini əhatə edir. Ermənistanla Azərbaycan Respublikasının sərhəd rayonlarından biridir. Rayon kimi 1930-cu ildə təşkil edilmişdir. Laçın adını isə Tağı Şahbazi (Simurq) vermişdir. Laçın alıcı quş deməkdir. Sahəsi 1883 $km^2$ –dir. Bakıdan Laçın şəhərinə qədər məsafə 443 km-dir.

Lakin Laçın şəhərinin bünövrəsi 1924-cü ildə qoyulmuşdur Laçın rayonunun 66 min əhalisi vardır. Laçının bir rayon və şəhər kimi formalaşıb inkişaf etməsində Tağı Şahbazi (Simurq), Hüsü Hacıyev, İsmayıl Şərifov, Qara İlyasov, Ocaqqulu Musayev, Canbaxış Abdullayev, Muradxan Cabbarov və başqalarının əməyi böyük olmuşdur.

200-ə yaxın mədəniyyət və memarlıq abidələri, yeraltı və yerüstü sərvətləri olan, bənzərsiz bir region, dünyada analoqu olmayan flora və faunaya malik olan Azərbaycanın – "Qüdrətdən səngərli qalalı dağlar" – diyarı – Laçın rayonu 1992-ci il may ayının 18-də ermənilər tərəfindən işğal olunmuşdur. 126 kənd yerlə yeksan edilmiş, 66 min əhali isə pərən-pərən salınmışdır. Laçın rayonu işğal altında olduğuna görə kəndlərin adlı siyahısını burada verməyi məqsədyönlü sayıram:

| | | | |
|---|---|---|---|
| 1. | Ağoğlan | 14 | Bozlu |
| 2. | Alpoud | 15 | Baldırğanlı |
| 3. | Avazlar | 16 | Bülüldüz |
| 4. | Ayıbazarı | 17 | Bozdağan |
| 5. | Ağanus | 18 | Bülövlük |
| 6. | Ağbulaq | 19 | Budaqdərə |
| 7. | Ağcakənd | 20 | Biçənis |
| 8. | Alxaslı | 21 | Cağazür |
| 9. | Ağcayazı | 22 | Cicimli |
| 10. | Arduşlu | 23 | Çorman |
| 11. | Alıcan | 24 | Çıraqlı |
| 12. | Ağalaruşağı | 25 | Çənbər kənd |
| 13. | Bozgüney | 26 | Daşlı |
| 27 | Dəyirmanyanı | 57 | Korcabulaq |
| 28 | Dəyhan | 58 | Kaha |
| 29 | Dambulaq | 59 | Köhnəkənd |
| 30 | Ərikli | 60 | Katos |

| | | | |
|---|---|---|---|
| 31 | Əyrək | 61 | Kərəvüz |
| 32 | Əhmədli | 62 | Köhnə Çorman |
| 33 | Əliqulu | 63 | Qarıqışlaq |
| 34 | Ərdəşəvi | 64 | Qılışlı |
| 35 | Ərəb Unannovu | 65 | Qarıkaha |
| 36 | Ələkçi | 66 | Qorçu |
| 37 | Aşağı Fərəcan | 67 | Qarabəyli |
| 38 | Farraş | 68 | Qoşasu |
| 39 | Fingə | 69 | Qızılca |
| 40 | Fətəlipəyə | 70 | Qışlaq |
| 41 | Güləbird | 71 | Qurdqajı |
| 42 | Hacılar | 72 | Yuxarı Fərəcan |
| 43 | Hətəmlər | 73 | Qalaça |
| 44 | Hacısamlı | 74 | Quşçu |
| 45 | Hüsülü (Sultanlar) | 75 | Qaraçanlı |
| 46 | Haqnəzər | 76 | Qozlu |
| 47 | Hoçaz | 77 | Qazıdərə |
| 48 | Xanalılar | 78 | Qovuşuq |
| 49 | Xırmanlar | 79 | Yuxarı Qarasaqqal |
| 50 | Xumarta | 80 | Aşağı Qarasaqqal |
| 51 | Xaçınyalı | 81 | Qarakeçdi |
| 52 | İrçan | 82 | İkinci İpək |
| 53 | Birinci İpək | 83 | Lolabağırlı |
| 54 | İmanlar | 84 | Mişni |
| 55 | Kamallı | 85 | Minkənd |
| 56 | Kalafalıq | 86 | Malıbəy |
| 87 | Mirik | 107 | Seyidlər |
| 88 | Mığıdərə | 108 | Şeylanlı |
| 89 | Mazutlu | 109 | Turşsu |

| | | | |
|---|---|---|---|
| 90 | Malxələf | 110 | Şamkənd |
| 91 | Məlikpəyə | 111 | Şəlvə |
| 92 | Mollalar | 112 | Türklər |
| 93 | Mayıs | 113 | Birinci Tığik |
| 94 | Muncuqlu | 113 | Tərxanlı |
| 95 | Nurəddin | 115 | Təzəkənd |
| 96 | Narışlar | 116 | İkinci Tığik |
| 97 | Aşağı Cicimli | 117 | Uludüz |
| 98 | Nağdalı | 118 | Vağazin |
| 99 | Oğuldərə | 119 | Vəlibəyli |
| 100 | Pircahan | 120 | Zeyvə |
| 101 | Səfiyan | 121 | Zerti |
| 102 | Suarası | 122 | Zağaltı |
| 103 | Soyuqbulaq | 126 | Zabux |
| 103 | Sadınlar | 124 | Ziyrik |
| 105 | Sonasar | 125 | Hacıxanlı |
| 106 | Sus | 126 | Ağbulaq |

Göründüyü kimi 126 kənd adı bizə yadigar qalmışdır. Bu adlar oğüz elini bu gün xatırladan mənəviyyat muzeyimizin daşlaşmış eksponat yaddaşıdır. Alpoud (Alpoğuz), Ağcayazı, Çıraqlı, Əyrək, Qorçu, Qurdqajı və s. kənd adları bizə Azərbaycan xalqının qədim tarixindən xəbər verir, oğuz elinin mənəviyyat dünyasının muzeyləşən yaddaşını vərəqləyir, qədim dövrlə bu gün arasında mənəviyyat körpüsü yaradır. Odur ki, öyrənirik ki, bu diyar ən qədim yaşayış məskənlərindən biri olmuşdur. Qeydə alınmış ən qədim məbəd IX əsrə aiddir. Bu Kosalar kənd ərazisində olan "Ağoğlan" qəsridir. Lakin qədim dövrlə bağlı abidələrin yozumu və sübütların açımı hələdə öz həllini tapmamış olaraq qalmışdır. Çoxlu abidələrin xaç nişanı altında pərdələnib aşkarlanmaması ən azı soy kökümüzə, tariximizə biganəlik kimi qiymətləndirilməlidir. Çünki xaç ermənilərə məxsus

tapınma deyildir. Ermənilər xaçı bizim əcdadlarımızdan 270 il sonra qəbul etmişlər. Əcdadlarımızın abidələrini xaç bayrağı altında özününküləşdirən erməni xalqına qarşı cahad elan etmək lazımdır. Əgər belə edilməzsə, ermənilər Azərbaycan xalqını yer üzündən silib öz arzularını reallaşdıracaqlar. Çünki onlar Alban izini yox edib, erməniləşdiriblər. İndi isə onların qarşılarına qoyduqları məqsəd Azərbaycanı yox etməkdir. Biz isə bunu dərk edib babalardan ərmağan olan vətən torpağını düşmənlərdən azad etməli, onu qoruyub gələcək nəslə təhvil verməliyik.

Laçın haqqında verdiyimiz bu bilgilər aysberqin görünən tərəfləridir. Məlumdur ki, aysberqin görünməyən tərəflərini elmin gözü ilə görmək lazımdır. Odur ki, elmi araşdırma və tarixi faktlar Laçın haqqında aşağıdakıları söyləyir:

Bəzən Laçın oykonimi Yalçın, bəzən isə Laçın (yəni quş) yuvası anlamı vermişdir. Bu yolla «Laçın» toponiminin əsl mənasının aydınlaşdırılması işi uzun illər kölgədə qalmışdır. Onu da qeyd etmək lazımdır ki, Laçın---Laçın (ovo) kimi Rusiya Fedarasiyasında şəhərdir.

«Laçın» toponimii bir oykonim kimi 1924-cü ildən xəritəmizdə özünə yer tapmışdır. Ona qədər isə bu ad Yuxarı Laçın adlı kənddə olmuşdur. Qismən qədim xəritələrdə araşdırmalar göstərir ki, Kiçik Qafqazın ən böyük silsiləsi olan Qarabağ sıra dağlarının əsas zirvəsi ilə yanaşı Laçın adlı bir zirvə də diqqəti cəlb edir bu zirvə Yuxarı Qarabağ bölgəsində Böyük Kirs, Kiçik Kirs, Sarı baba zirvəsi ilə üçbucaq təşkil edir. Bu zirvə Qarabağ sıra dağlarının mərkəzi hissəsində, onun cənub qərbində yerləşir. Laçın dağının coğrafi quruluşu onun bir oronim kimi mənasını araşdırmaq baxımından maraq doğurur. Araşdırmalar göstərir ki, «Laçın» Adı coğrafi, tarixi və ədəbi mənbələrdə rast gəlinir. Mənbələrdən göründüyü kimi, «Laçın» toponimii əvvəllər bir oronim-yəni dağ Adı kimi bizə məlum olur. Daha sonralar isə bu toponim tədricən oykonim şəklində özünə bir növ vətəndaşlıq hüququ qazanmışdır. Bunu Laçın adlı kəndlərdə görə bilirik. Qeyd etdiyimiz kimi bu adın sorağı ilə ədəbi materiallara müraciət etdik. Məşhur hind şairi Əmir Xosrov Dəhləvinin həyatından bəhs edən mənbələrdə onun atasının soyadında «Laçın» sözü diqqətimizi cəlb etdi. Onun Adı mənbələrdə aşağıdakı kimi qeyd olunur. Əmir Mahmud Şəms Laçın, Əmir Mahmud Şəmsin adındakı «Laçın» sözü maraq doğurur. Tarixi mənbələrdən aydın oldu ki, onun ata-babası buraya Orta Asiyanın işğalı ilə əlaqədar gəlmişdir. O zaman

«Laçın» türk tayfası Türkmənstanın cənubunda Kopetdağında məskun olmuşlar. Hindistanda yaşayıb - yaratmış dövrünün Ən böyük şairi kimi ad – san çıxarmış Əmir Xosrov Dəhləvinin adında tayfasının adı göstərilmişdir. Onun əsl adı Əbdül Həsən Əmirbin Əmir Seyfəddin Mahmud Şəms olmuşdur. Göstərdiyimiz kimi atasının adında «Laçın» sözü var (Az.Sov. Ensk VI cild. Bakı 1980 səh. 203). Ensiklopediyada qeyd olunur ki, o, Orta Asiyanın türkdilli xalqlarından çıxmışdır. O dövrünün böyük Hind şairlərindən Əmir Həsən Dəhləvi də (1253-1337) Əmir Xosrov Dəhləvinin qan qohumu və yaxın dostu olmuşdur.(12,60)

Qeyd edək ki, indiki xəritələrimizin əksəriyyətində Laçın inzibati rayonu ərazisində eyni adlı çay yoxdur. Lakin xəritədə Adı Həkəri olmasına baxmayaraq, yerli əhali bu çaya çox vaxt Böyük çay və ya sadəcə Laçın çayı deyirdilər. Yuxarı Qarabağ bölgəsində Qarqar çaya qovuşan Xəlfəli çayın bir qolu Laçın adlanır. Rəşidəddinin yazdığına görə Oğuzların 24 onqonunun birinin Adı cürə Laçın olmuşdur. Laçın (Laçın) tayfası isə XIII əsrin əvvələrində Türkmənstanın cənubundakı ərazilərdə yaşayırdılar. Müəlliflər göstərir ki, Monqolların hücumu zamanı Laçın tayfalarının bir hissəsi Azərbaycana pənah gətirmişlər. Onlar Qarabağın yuxarı bölgəsində Xaçın (bəlkə də Laçın), Xəlfəli, Qarqar, Həkəri və qismən də indiki Kəlbəcər ərazisindən axan çay hövzəsində məskən salmışlar. Laçınlıların bir hissəsi isə qeyd etdiyimiz kimi Hindistanda sığınacaq tapmışdılar.

Araşdırmalar göstərir ki, Yuxarı Qarabağda məskunlaşmış Laçınlılar indiki Şuşa, Kəlbəcər və Laçın rayonları ərazisində kənd salmışlar, Şuşada bu kəndə Laçınlılar, Laçın rayonunda Yuxarı Laçın, Kəlbəcərdə isə Laçın adı verilmişdir. Bu tayfanın indi də xeyli maddi-mədəniyyət abidələri qalır. Vaxtı ilə Laçınlılar tayasının adları yazılan sikkə də buraxmışdır[1].

Dədə Qorqud dastanında qeyd olunan Oğuz tayfaları və Oğuz yer-yurd adları ilə səsləşən, həmçinin eyniyyət təşkil edən onomastik vahidlər Laçın rayonu ərazisində yüzlərcədir. Odur ki, bu rayonun, yəni Laçın ərazisini qədim Oğuz yurdu, türk uluslarının yaşayış məskəni adlandırmaq heç də təsadüfi deyildir. Burada qeyd etdiyimiz kimi Ağcayazı, Qorçu, Alpoud, Əyrək, Qurdqajı, Uludüz, Ağ qaya, Şirakar, Qırxqız dağı (Qırx Oğuz yurdu), Kiş dağı və s. Bu qəbildən olan onomastik vahidlər nəinki oğuz eli ilə, hətta daha qədim dövrlə eramızdan altı min il

əvvəl mövcud olmuş Şumerlərlə tam eyniyyət təşkil edən leksik anlam kimi özünü göstərir.

«Laçın boyu türk dünyasına adlı igidlər, dövlət xadimləri vermişdir. Onlardan biri əl-Məlik əl-Mənsur Hüsam əd-din Laçın əl-Mənsuri idi. O, 1296-1298-ci illərdə Misir sultanı olmuşdu… Dəməşq şəhərindən şimalda Xan Laçın adlı qala saldırmışdı.

Laçın qəbiləsi Azərbaycanda monqollardan qabaq yaşayırdı. Bunu Orta Əsrlərdə Qarabağda Laçın şəhərinin olması göstərir. Kirakos Qanzaketsi yazır ki, Laçın Həsən Cəlalın qalalarından biridir.

Azərbaycanda başqa bir Laçın şəhəri də vardı. Hətta o, elə bir şəhər idi ki, orada pul kəsilirdi. Bu Orta Əsr şəhəri Çobani xanlarının zamanında daha şöhrətlənmişdi.

Ulu Laçın elinin yadigarı kimi indi Azərbaycanda Laçın şəhəri, Şuşa və Kəlbəcərdə Laçın köyləri qalmışdır. Bizə elə gəlir ki, Laçın oğuz tayfalarından biri olub. Onların bir hissəsi səlcuq bəyləri ilə Azərbaycana gəlmiş, bir hissəsi isə Volqa çayı sahillərində qalaraq qıpçaqlarla qarışmışdır»(7,52)

Qədim oğuz tayfalarının adları ilə səsləşən onomastik vahidlər Azərbayjanın bütün rayonlarında bu gün də özünü qoruyub saxlamaqdadır. Məsələn, Abşeron rayonunda Güzdək kəndi, Ağdam rayonunda Quzanlı kəndi,

Ağdaşda-Qaradağlı kəndi, Ovçulu kəndi,

Ağsuda –Bozvənd kəndi, Quzay (Oğuz – ay) kəndi, Qaradağ kəndi

Ağcabədidə – Qiyamədinli (Qayı mətinli – Ə.Ə) kəndi, Boyat kəndi

Bərdədə – Alpoud, Bala Qəcər kəndləri.

Oğuzda – Bayan kəndi, Baş Daşağıl kəndi.

Qazaxda – Alpoud kəndi, Qarayazı qəsəbəsi, Çaxmaxlı kəndi

Goranboyda – Qazançı, Qaradağlı, Alpoud kəndləri

Qaxda – Qıpçaq, Baydarlı, Qaysarlı, Tanğıt, Qoraqan kəndləri

Qubadlıda – Qayalı, Dondarlı, Qazyan kəndləri

Qəbələdə – Uludaş, Dandıx kəndləri

Dəvəçidə – Vələsdi, Bilici Qorqan, Uzunboyad kəndləri

Zəngilanda – Qazançı kəndi

Kəlbəcərdə – Ağ qaya, Tirkeşəvənd, Yanşaq, Boyur kəndləri

Göyçayda – Alpoud, Qarayazı, Ulaşlı, Şıxlı kəndləri

Tərtərdə – Qazyan, Qaradağlı, Bayandurlu kəndləri

Şəkidə – Aşağı Daşağıl, Qaradağlı, Kiş, Oxut kəndləri

Sabirabadda – Qalaqayın kəndi

Salyanda – Boyat kəndi

Tovuzda – Dondar Quşçu, Dondarlı kəndləri

Ucarda – Alpoud, Boyat, Qazyan , qaradağlı kəndləri

Füzulidə – Qaradağlı, Aşağı Güzlək, Dədəli, Qorqan kəndləri

Xaçmazda – Çaxmaxlı, Dədəli, Ağjayazıbuduq, Qalaqayın kəndləri

Cəbrayılda – Qazanzəmi, Tulus kəndləri

Şamaxıda – Ovçulu, Dədəgünəş, Boyat kəndləri

Culfada – Qazançı kəndi

Şuşada – Qaybalı kəndi və s.

Göründüyü kimi bütövlükdə Azərbaycan qədim oğuz yurdu,Türk – oğuz diyarıdır. Xalqın yaşadığı əxlaqi-mənəvi mühit xalqın yaddaş salnaməsi olan «Kitabi-Dədə Qorqud» dastanında öz əksini tapmışdır. Odur ki, oğuz elinin əxlaqi-mənəvi dəyərlərinin yaşantıları müasir dünyamızın Ən qiymətli naxışlarıdır.

Erməni qəspkarlarının törətdikləri vəhşilikləri, məhv etdikləri maddi və mənəvi dəyərlərimizi yaddan çıxarmamaq, bunları yazıya almaq hər birimizin borcudur. Odur ki, Laçın rayonu üzrə olan kəndlər haqında qısa məlumat verməyi önəmli sayıb, imkanım daxilində bəzi məlumatları qələmə aldım. Həmçinin hər bir kəndin adının leksik anlamının izahını, həmin kəndin rayon mərkəzinə nəzərən yerləşmə nöqtəsini, əhalisini, kəndin sosial obyektlərini, əhalinin hansı soydan, tirədən, etnik bölümdən olmasını qısa da olsa qələmə almaqla bərabər həmin kəndin şəhid və itgin övladlarını da qeydə aldım. Çünki şəhidlər xalqımızın qəhrəmanlıq salnaməsi, and yerimiz, müqəddəs amalımız, bizi yaşatmağa və düşmənə qarşı amansız olmağa səsləyən şah əsərimizdir. Nə qədər ki, Azərbaycan xalqı var şəhidlər unudulmayacaq, daimi olaraq, qəlbimizdə əbədi məşəl kimi yanacaq və anılacaqdır. Şəhidlərin fəxarət rəmzi

kimi anılmasını nəzərə alaraq hər bir kəndin şəhid olmuş və itgin düşmüş adamını həmin kəndə ayrılmış səhifədə verməyi önəmli saydıq. Qoy hər bir kəndin gələcək nəsil davamçısı öz qəhrəmanlıq səhifəsini vərəqləyəndə qürur hissi duyub, soykökünü fəxrlə xatırlasın. Həmçinin düşmənini yaddan çıxarmasın. Qoy şəhidlər bizim qan yaddaşımız olsun!

## Laçın şəhərinin qan yaddaşı
## Şəhidlik zirvəsinin fatehləri, girov və itgin düşənlər haqqında.

1. Nazim Xanlar oğlu Abdullayev (1967-1993)
2. Şahin Şiraslan oğlu Atakişiyev (1969-1994)
3. Namiq Şamil oğlu Abdullayev (1962-1992)
4. Yusif Əli oğlu Bayramov (1966-1994)
5. Natiq Rafiq oğlu Babayev (1968-1992)
6. Rəhman Əli oğlu Əliyev (1970-1994)
7. Bəhmən İbiş oğlu Əliyev (1966-1992)
8. Sahib Nəriman oğlu Əhmədov (1963-1993_
9. Şahin Əhliyət oğlu Əhmədov (1968-1992)
10. Ramiz İsmayıl oğlu Heydərov (1965-1992)
11. Mətləb Allahyar oğlu Həsənov (1959-1992)
12. Cavanşir İsmayıl oğlu Nağıyev (1960-1992)
13. Namiq Yəhya oğlu Əmralıyev (1967-1992)
14. Firdovsi Səfi oğlu Tağıyev (1961-1991)
15. Rafiq Cəmil oğlu Tağıyev (1970-1992)
16. Elçin Vahid oğlu Muxtarov (1969-1994)
17. Rəsul Şahverdi oğlu Şahverdiyev (1950-1995)
18. Mahmud Aslan oğlu Abbasov (1968-1992)
19. Bəxtiyar Oktay oğlu Hacıyev (1973-1993)

20. Aydın Qaytaran oğlu Şirinov (1937-1992)
21. Asif Bəhlul oğlu Hüseynov (1955-1989)
22. Rəmzi Əsgər oğlu Əsgərov (1969-1992)
23. Elşad Mətləb oğlu Bağırov (1978-?)
24. Münəvvər Aydın qızı Mustafayeva (1969-?)
25. Nəbi İmran oğlu İsmayılov (1969-1992)

## Ağoğlan qəsri

Bu tarixi abidə haqqında müxtəlif əfsanələr söylənilir. Deyilənə görə Ağoğlan adlı bir nəfərin tikdirdiyi qəsri xalq onun şərəfinə "Ağoğlan qəsri" adlandırmışdır. Lakin bu bir əfsanə olaraq qalır. Çünki qəsr Alban dövrünün yadigarıdır. "Ağoğlan" adı isə xalq mifologiyasının yaradıcılıq süzgəcindən süzülən və tarixin daş yaddaşına hopan bir onqondur.




Bu inanc xalq nağılımızın qəhrəmanı Ağ atlı oğlan, Ağaşıq , Ağ atlı Xızır, İlyas, Ağ bulaq, Ağsu və və s. bu kimi adlarda ağ sözünün xeyir gətirən inam mənbəyi olması anlamını formalaşdırıb.

Ağoğlan qəsri Laçın rayonunda qeydə alınmış ən qədim abidədir. Bu qəsr IX əsrdə inşa edilmişdir. ağsaqqal babalar, ağbirçək nənələr Ağoğlan qəsri haqqında belə söyləyirlər ki, bu yerlərə bir igid oğlan gəlir. Kosalar kəndi ərazisində olan qəsri tikməyə başlayır. Qəsrin tikintisində işləyənlərə yemək çəkilməsi zamanı bir qaranquş özünü ora-bura çırpır və qazandan yemək çəkilməsinə imkan vermir. Heç kim quşun bu hərəkətini anlaya bilmir və qaranquşu qovmağa çalışırlar. Lakin qaranquş özünü yemək qazanının içinə atıb öldürür. Sanki özünü şəhid edir. Bunu

görən adamlar bişirilmiş yeməyi yerə tökməyi məsləhət edirlər. Bişmiş qazandan yerə töküldükdə görürlər ki, qazanın içinə zəhərli bir ilan düşübmüş. Hamı qaranquşun nə üçün özünü şəhid etdiyini anlayırlar. Qaranquşu təntənəli şəkildə dəfn edirlər. Bu hadisəyə görə tikilmiş qəsri "Qaranquş qəsri" adlandırırlar. Lakin sonralar qəsri tikən xeyirxah insanın şərəfinə "Ağoğlan qəsri" adlandırırlar.

Təbiətə, təbiətin yaratdığı varlıqlara bəşər övladının tapınması obyektiv reallıq və təbii prosesdir. Odur ki, xalqımızın müxtəlif varlıqları onqon soyması, ona tapınması və bu gün də həmin anlamları yaşatmaları mifologiyamızın dərin qatlarından xəbər verir. Xalqımızın tapındığı varlıqlardan biri də quş onqonudur. Quş onqonları Azərbaycan onomastikasında bu gün də öz izlərini qoruyub saxlamışdır. Bu izləri biz yer adlarında və şəxs adlarında görə bilərik.

Yer adları: Laçın, Quşçu, Tovuz, Kəlbəcər, Toğana, Tər-tər və s.

Şəxs adları: Laçın, Tovuz, Şahin, Durna, Bülbül, Göyərçin, Səməndər, Turac, Kəklik, Əkil, Bəkil, Simurq, Humay, Toğrul, Zümrüd və s.

Beləliklə, xalq tikilmiş qəsrə müjdə rəmzi olan qaranquş adını verməsi heç də təsadüfü deyildir.

Çünki bu ərazidə ən qədim abidə Ağoğlan qəsridir. Sonralar abidənin gerçəklik, doğruluq, reallıq olduğunu bildirmək üçün "Ağ" sözündən istifadə etmişlər. Həmçinin insan arzusu ilə insan oğlunun yaratdığı bir abidə olduğunu bildirmək üçün "oğlan" sözünü ora əlavə edir, "Ağoğlan qəsri" adlandırmışlar.

"Ağ" sözü ucalıq, alilik, soy kökü kimi anlamlarında işlənmişdir. Xalqımızın tarixi mənəviyyat muzeyi sayılan "Dədə Qorqud" dastanında Qazan bəy öz soyunu, öz kökünü belə bildirir:

Ağ qayanan qaplanının erkəyində bir köküm var,
Ortac qırda sizin keyikləriniz durğurmaya.
Ağ sazın aslanında bir köküm var,
Qaz alaca yündünü durğurmaya,
Ağ sunqur quşu erkəyində bir köküm var,
Ala ördək, qara qazın uçurtmaya (4, 114)

Göründüyü kimi Qazan bəy öz soyunun ulu, müqəddəs olduğunu bildirmək üçün ağ sözündən istifadə etməklə ağ qayanı, ağ sazı, ağ sunqur quşunun müqəddəsliyini diqqətə çatdırmışdır. Ağ sözü isə gerçəklik, ucalıq, alilik anlamında işlənmişdir. Biz bu anlamları dilimizdə bu gün də tşlənən bəzi ifadələrdən də hiss edirik. Məsələn, dilimizdə işlənən "ağ yalan" ifadəsində "ağ" sözü doğru, gerçək anlamını verir, yəni doğru yalan, gerçək yalan mənasında işlənir. Olmuş iş haqqında yalan danışmaq ağ yalan sayılmır, bu doğrunu inkar etmək, yalan danışmaq sayılır, amma olmamış, hətta həyatda mümkün olmayan bir iş haqqında söylənmiş yalan "ağ yalan" adlandırılır.

Buna "xalis yalan" da demək olar. Bəzən belə deyilir ki, (ağ eləmisən.) Bu o deməkdir ki, bəlli, aşikar edib, gerçəkləmişsən.

Yenə də ağ sözü doğruluq, gerçəklik anlamını verir. buradan belə bir nəticəyə gəlmək olar ki, xalq yaratdığı tarixi abidənin adını "Quş qəsri" deyil, həqiqətən, doğrudan da "Oğlan qəsri" olduğunu sübut etmək üçün oğlan sözünə "ağ" təyinedici sözünü əlavə edib "Ağoğlan qəsri" ifadəsini yaratmışdır. Xalq abidəni yaratdığı kimi onun adını da süzgəcdən keçirib formalaşdırmışdır

# Qədim Türk uluslarının yaşayış məskəni, Oğuz yurdu olan LAÇININ kəndləri

## Alpout kəndi.

Bu kənd rayon mərkəzindən 40 km. şimal qərbdə yerləşirdi. Məktəb, kitabxana, klub və mağazası var idi.

Bu adda yaşayış məskəni Qazax, Göyçay, Ucar və Bərdədə də vardır. Alpoud sözü iki komponentdən ibarətdir.(Alp və oud.) Alp sözünə Alp Aruz, Alp-ər Tonqa, Alp-Arslan tərkiblərində rast gəlirik. Alp igid mənasında XV əsrə qədər dilimizdə işlənmişdir. XV əsrdən sonra mənbələrdə bu sözə rast gəlinmir. Qeyd etmək lazımdır ki, «Dədə Qorqud»da «alp» sözü ilə yanaşı dəli sözü də igid mənasında işlənmişdir. (Dəli Domrul, Dəli Budaq) XV əsrdən sonra alp sözü arxa plana keçmiş, dəli sözü igid mənasında ümumişləklik qazanmışdır. «Koroğlu» dastanında (Dəli Həsən) igidlərin hamısı dəli adlandırılır. (Koroğlunun dəliləri deyilir). Sonralar bu söz də arxaikləşmiş və dilimizdə igid sözü işlənmişdir.

Alpout sözündəki ikinci komponent «oud» isə bout, boyat, boud, oud, bayat-el mənasında işlənir. Yəni igid boyat eli, igid oğuz eli (oud-oğuz) mənasında işlənir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Əşrəf Yediyar oğlu Nəsibov (1968-1992)

## Avazlar kəndi.

Bu kənd rayon mərkəzindən 25 km. şimal qərbdə yerləşirdi. Kəndin məktəbi, klubu, kitabxanası və mağazası var idi.

Bu kəndin adı Avaz tayfasının yaşadığı ərazi mənasında Avazlar toponimi kimi formalaşmışdır. Avaz adında şəxs də vardır. Xalq arasında – Avazın yaxşı gəlir oxuduğun Quran olsa – deyirlər. Burada avaz səs, ün, intonasiya mənasında işlənir. Lakin bu kəndin adı tayfa adından götürülmüşdür.

**Ayıbazarı kəndi.**

Rayon mərkəzindən 45 km. şimal qərbdə yerləşirdi. Bu kənddə məktəb, klub, kitabxana və s. sosial obyektlər var idi.

**Ağcakənd kəndi.**

Təxminən rayon mərkəzindən 50 km. qərbdə yerləşir. Əhalisi 524 nəfərdir. Orta məktəbi, klub, kitabxana, həkim məntəqəsi, mağaza və s. sosial obyektləri var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Zöhrab Cəlal oğlu Ələkbərov

**Alxaslı kəndi**

Rayon mərkəzindən təxminən 50 km. şimal qərbdə yerləşir. Əhalisi 1390 nəfərdir. Orta məktəb, xəstəxana, klub, kitabxana, poçt, mağaza və s. sosial obyektləri var idi. Alxaslı sözünün leksik anlamına gəlincə, onu demək olar ki, Alxaslı sözündəki al komponenti uca mənasındadır. Albuz sözündə də al komponenti və bütövlükdə sözün leksik anlamı böyük uca deməkdir. Alxaslı sözündə «al» hissəciyi uca xaslı yəni, ali irqə məxsus, uca, ali rəng mənasında işlənir. Başqa bir yozuma əsasən dilimizdə işlənən xasqırmızı rəng anlamının «alxas» şəklində işlənməsi məqamında al-qırmızı, xas isə sifətin çoxaltma dərəcəsi kimi çıxış edir. Yəni alxas qıpqırmızı, tünd-qırmızı mənasındadır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Qasım Ayaz oğlu Alxasov (1968-1992)
2. Polad Hətəm oğlu Bəylərov (1970-1992)
3. Şirin Allahverdi oğlu Cəfərov (1962-1994)
4. Əşrəf Rəhbər oğlu Məmmədov (1972-1993)
5.Ərəstün Mətləb oğlu Bəylərov (
6.Qanboy Əhmədəli oğlu Səfərəliyev (1931-1991)

7. Səlahət Əhliyyət oğlu Salahov (1973-?)
8. Mirzə Xəlil oğlu İsgəndərov (1972-?)

**Ağanus kəndi.**

Rayon mərkəzindən təxminən 10 km. cənubda yerləşirdi. Əhalisi 192 nəfərdir. Orta məktəb, klub, kitabxana, çayxana, pavilyon, tibb məntəqəsi, poçt, 2 mağaza və s. sosial obyektləri var idi.

Ağanus sözü Ağa və Yunus sözlərindən ibarətdir. Yunus şəxs adı kimi geniş yayılmışdır. Bəzən bu ad Yunus, Hünüs, Hunus şəklində toponim kimi də işlənir. (Hünüsün meşəsi, Hünüsün yalı).

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Bəbir Əvəz oğlu Mərdanov (1969-1994)
2. Qaçay Surxay oğlu Məhərrəmov (1936-1992)
3. Təvəkkül Adil oğlu Məhərrəmov (1935-1990)

**Ağbulaq kəndi**

Rayon mərkəzindən təxminən 62 km. şimal qərbdə yerləşir. Əhalisi 998 nəfərdir. Orta məktəb, klub, kitabxana, xəstəxana, poçt, 3 mağaza və s. sosial obyektləri var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. İmran Səlim oğlu Imranov (1939-?)
2. Nabat Əliş qızı İmranov (1947-?)
3. Əmir Allahqulu oğlu Əsgərov (1924-?)
4. Zərifə Sarı qızı Məmmədova (1938-?)
5. Cəfərqulu Bəxtiyar oğlu Bəxtiyarov (1947-?)

**Ağoğlan kəndi.**

Bu kənd rayon mərkəzindən 26 km. cənub qərbdə yerləşir. Əhalisi 219 nəfərdir. Kənddə orta məktəb, klub, kitabxana, tibb məntəqəsi və telefon dayaq məntəqəsi kimi sosial obyektlər var idi. Bu kəndin adı əvvəllər Kosalar olubdur. Sonradan Ağoğlan qəsrinə əsasən kəndi Ağoğlan adlandırıblar. Əslində kəndin adı Kosalardır. Azərbaycanın bir sıra rayonlarında Kosalar adında yaşayış məskənləri mövcuddur. Bu onunla bağlıdır ki, Kosalar tayfa adıdır. Bu tayfanın nümayəndələri harada məskunlaşıblarsa oranı Kosalar adlandırıblar. Kosalar kəndinin adı da belə formalaşmışdır. Kosalar adına Qazaxda, Lənkəranda, Şamaxıda, Naxçıvanda, Xankəndində və hətta Gürcüstanda da rast gəlinir.

**Arduşlu kəndi.**

Rayon mərkəzindən təxminən 58 km. şimal qərbdə yerləşirdi. Əhalisi 564 nəfərdir. Burada orta məktəb, klub, kitabxana, mağaza və s. sosial obyektlər var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Xıdır Sədrəddin oğlu Cabbarov (1969-1992)
2. Zöhrab Telman oğlu Əsgərov (1973-1993)
3. Əzim Zahid oğlu Qasımov (1970-1992)
4. Seyfəli Əli oğlu Qədirov (1947-1992_
5. İdris Həmzə oğlu Alməmmədov (1933-1992)
6. Ehtiram Idris oğlu Alməmmədov (1976-1992)
7. Mahirə Fərhad qızı Alməmmədova (1991-1992)
8. Fariz Ədalət oğlu Alməmmədov (1991-1992)
9. Azad Pirqulu oğlu Cabbarov (1965-1992)

**Ağcayazı kəndi.**

Rayon mərkəzindən təxminən 43 km. şimal qərbdə yerləşirdi. Əhalisi 124 nəfər idi. Burada mağaza, ibtidai məktəb, klub, kitabxana kimi sosial obyektlər fəaliyyət göstərirdi.

Ağcayazı qədim türk soy adıdır. Ağcayazı sözündə olan ağ və yazı sözləri ən qədim söz olmaqla yanaşı həm də milli sözlərimizdir. Ağca və yazı sözlərinə ən çox «Dədə Qorqud» eposunun dilində rast gəlirik. Ağca sözü rəng mənasında deyil, böyük, ulu anlamında işlənmişdir. Yazı isə qoruq mənasında işlənir. Ağcayazı sözü böyük qoruq, ulu qoruq anlamını verir. Deməli, Ağcayazı sözü Oğuz elinin yaşantısı kimi bu gün də dilimizdə işlənməkdədir.

**Alıqulu kəndi.**

Rayon mərkəzindən təxminən 38 km. şimal qərbdə yerləşirdi. Əhalisi 385 nəfərdir. Bu kənddə məktəb, kitabxana, poçt, klub, çörəkbişirmə sexi var idi. Kəndin adı xalq arasında «Alqulu» şəklində tələffüz olunurdu. Əslində də belə olmalı idi. Çünki bu kənd Alı kişinin erməni qullarının himayə edib saxladığı məkan olubdur. Ona görə də buraya Alıqulu kəndi adı verilib. Sonralar rəsmi sənədlərdə «Alqullar» adı ilə bu kənd adı formalaşıbdır. Bu kəndin əhalisi də Alı bəyin nəslidir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Sədrəddin Nurəddin oğlu Allahyarov (1968-1993)
2. İlqar Nurəddin oğlu Allahyarov (1968-1993)

**Alıcan kəndi.**

Rayon mərkəzindən 36 km. şərqdə yerləşir. Otuz evdən ibarət olan bu kəndi ermənilər yandırıblar. Burada ibtidai məktəb, kitabxana, mağaza və tibb məntəqəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Allahverdi Əsgər oğlu Əliyev (1969-1992)
2. Qəzənfər Nuruş oğlu Əliyev (1960-1993)

**Ağalaruşağı kəndi.**

Rayon mərkəzindən 75 km. şimal qərbdə yerləşir. Əsas məktəbi və mağazası var idi. Ağalar kişinin nəslinin yaşadığı ərazi olduğu üçün kənd Ağalaruşağı adlanırda. Əhalisi 113 nəfərdir.

**Bozgüney kəndi.**

Rayon mərkəzindən 52 km. şimal qərbdə yerləşir. Əhalisi 375 nəfərdir. İbtidai məktəb, klub, kitabxana və mağazası var idi.

«Bozgüney» sözündəki «Boz» komponentinin rəng mənasında olması aydın olsa da, maraqlıdır ki, «boz» sözü bir çox məqamlarda lap qədimlərdən dilimizdə işlənməkdədir. Məsələn, Boz qurd, Boz ox, Bozlu, Boz at, Boz qaya, Bozdağan və s. bu kimi sözlərdə boz sözü rəng mənasında deyil, ulu, müqəddəs anlamında işlənmişdir. Odur ki, Bozgüney toponimi ulu, müqəddəs məkan anlamında işlənir. Laçın rayonunda Boz sözü ilə başlanan kənd adları çoxdur (Bozgüney, Bozdağan, Bozlu). Boz şəxs adı kimi də işlənir. Türkiyənin Bursa şəhərinin İnkaya kəndində 700 yaşı olan çinarın sahibinin adı Mustafa Bozdur.

**Bozlu kəndi.**

Rayon mərkəzindən 40 km. şimal qərbdə Minkənd çayının (Həkəri çayının qolu) sol sahilində, Qarabağ yaylasındadır. Əhalisi 761 nəfərdir. Bu kənddə yağ-pendir zavodu, orta məktəb, kitabxana, tibb məntəqəsi, rabitə şöbəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Azərbaycan Respublikasının Milli Qəhrəmanı Kamil Baladə oğlu Nəsibov (1946-1992)

2. Bakir Rəşid oğlu Mehralıyev (1966-1992)
3. Musevib Yusif oğlu Museyibov (1973-1994)

**Biçənis kəndi.**

Rayon mərkəzindən 45 km. şimal qərbdə yerləşir. Əhalisi 352 nəfərdir. Burada orta məktəb, kitabxana, mağaza, tibb məntəqəsi, mədəniyyət evi, çörəkbişirmə sexi, rabitə şöbəsi kimi sosial obyektlər var idi.

Bu kənd qədim kəndlərdən biridir. Kəndin ərazisində qədim tarixə malik alban abidələri onlarcadır. Belə bir yozum vardır ki, bu kənd Bikə Yunisin adını daşıyır. Biçənis

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri və itgin, girov düşənlər.*

1. Məmməd Tahir oğlu Əhmədov (1970-1992)
2. Minarə Qasım qızı Alməmmədova (1934-1992)
3. Zeynəb Cəmil qızı Alməmmədova (1972-1992)
4. Kəmalə Şəmil qızı Alməmmədova (1976-1992)
5. Zeynəb Hüseyn qızı Muradova (1980-1992)
6. Rəfiqə Ağalar qızı Əhmədova (1934-1993)
7. Sahib Təvəkkül oğlu Zeynalov (1962-)

**Budaqdərə kəndi.**

Rayon mərkəzindən 70 km. şimal qərbdə yerləşirdi. Əsas məktəb, xəstəxana, klub, kitabxana və iki mağazası var idi.

Budaq kişinin məskunlaşdığı ərazi mənasında Budaqdərə toponimi formalaşmışdır. Budaq kişi Zəngibasar mahalının Çobankərə kəndindəndir. Vaxtilə ermənilərin əlindən baş götürüb qaçmış və burada məskunlaşmışdır. Hal-hazırda isə Budaq kişinin nəsli yenə də erməni təcavüzünə məruz qalmış və Azərbaycanda qaçqın kimi yaşayır. Bəhmən Vətənoğlunun bir ifadəsini özəlləşdirsək, onda belə demək olar: «Vətənoğlu vətəndə vətənsiz vətəndaşdır».

**Bülüldüz kəndi.**

Rayon mərkəzindən təxminən 26 km. şimal qərbdə yerləşirdi. Əhalisi 686 nəfərdir. Kənddə orta məktəb, klub, kitabxana,tibb məntəqəsi, çörəkbişirmə sexi, poçt və iki mağaza var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Zakir Kamran oğlu Əmirov(1955-?)
2. Adil Ələsdan oğlu Cəfərov (1972-1993)

**Bülövlük kəndi.**

Rayon mərkəzindən təxminən 49 km. şimal qərbdə yerləşirdi. İbtidai məktəb, kitabxana və mağazası var idi. Bu kəndin adı bütöv daşı çox olan yer anlamını verir. Bütöv hər hansı aləti itiləmək üçün təbii cilalı daşdır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri və itgin, girov düşənlər.*

1. Kəriş Qiyas oğlu Nəsibov (1973-1992)
2. Kamran Museyib oğlu Abdurrəhmanov (1927-?)
3. Imanverdi Kamran oğlu Abdurrəhmanov (1967-?)

**Vağazin kəndi.**

Rayon mərkəzindən təxminən 41 km. şimal qərbdə yerləşir. Əhalisi 1098 nəfərdir. Orta məktəb, kitabxana, klub, tibb məntəqəsi və rabitə qovşağı var idi.

Bu kənd qədim tarixə malik olan kəndlərdən biridir. Alban dövrünə aid abidələr bu ərazidə onlarcadır. Məncə, Vağazin adı da alban dövrünün yaşantılarındandır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Baxşəli Məmmədbağır oğlu İsayev (1940-1992)
2. Nadir Mikayıl oğlu İsayev (1964-1992)
3. Əlösət Həmid oğlu Sarıyev (1969-1992)

4. Ələddin Süleyman oğlu Süleymanov (1959-1993)
5. Nəsir Rəhim oğlu Nəsibov (1937-1992)
6. Səməd Aydın oğlu Əmirov (1932-1992)
7. Müzəffər Əfqan oğlu Qiyasov (1971-1992)

**Quşçu kəndi**

Kəndin adı qədim mifoloji inamlara söykənir. Belə ki, qədim dövrlərdə Azərbaycan türkləri arasında quş anqonu geniş yayılmışdı. Odur ki, nağıl və dastanlarda quşlara xüsusi yer verilmişdir. Hətta oğuz qəbilələri quşu özü üçün simvol və yaxud onqon seçmişlər. Hətta xalq arasında geniş yayılmış Dövlət quşu haqqında rəvayətlər imkan verir deyək ki, quşu var-dövlət, başda ağıl səviyyəsinə qədər yüksəltmişlər. Dövlət quşu kimin başına qonarmışsa onu padişah seçərmişlər. Azərbaycan xalqının əski mifologiyasında Simurq, Səməndər, Humay, Şahin və s. bir sıra quşlara insanınköməkçisi, uğur gətirən bir varlıq kimi baxmışlar. Odur ki, xalqımızın quş onqonuna inamının nəticəsidir ki, Azərbaycanda quş adları toponim kimi geniş yayılmışdır. Ehtimal olunur ki, quşla bağlı tayfadan olan adamlar məskunlaşdığı məkanı quşçu tayfasının yaşadığı ərazi kimi adlandırmışlar. Quşçu kəndinin bir toponim kimi formalaşması belədir. Quşçu kəndinin adına Tovuz, Daşkəsən və Şamaxı rayonlarında rast gəlirik. Quşçu kəndi qədim kəndlərdən biridir. Burada XV əsrə aid tarixi abidələr, «Uşaq qalası» adlanan tarixi abidə vardır.

Əhalisi 824 nəfərdir. Kənddə iki mağaza, poçt, orta məktəb, kitabxana, klub və çörəkbişirmə sexi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Sabir Əhməd oğlu Həsənov (1964-1992)
2. Bakir Əhməd oğlu Nəzərov (1968-)
3. Ələsgər Qədim oğlu Isaxanov (1957-1992)
4. Mənsur Ceyhun oğlu Şirinov (1967-1994)
5. Qüdrət Səfqulu oğlu İbrahimov (1941-1992)
6. Bakir Əliqulu oğlu İbrahimov (1974-1992)

**Qarıqışlaq kəndi.**

Rayon mərkəzindən 35 km. şimal qərbdə yerləşir. Əhalisi 1515 nəfərdir. Burada iki mağaza, orta məktəb, kitabxana, xəstəxana, çörəkbişirmə sexi, klub, daş emalı sexi, pavilyon, çayxana var idi. Kənd qədim abidələrlə əhatə olunmuşdur. Burada XI əsrə aid Dəmirovlu pir məbəd, Əli bulağı adlanan yerdə «Sultan baba» türbəsi vardır. Kəndin adının leksik anlamı ulu məkan deməkdir, yəni qarı qədim, ulu deməkdir, qışlaq isə məkan, yer anlamında işlənir. Qarlı qışlaq kimi də şərh etmək olar.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehl*əri.

1. İbiş Eyvaz oğlu Əsgərov (1926-1991)
2. Tahir Məmməd oğlu Məmmədov (1963-1991)
3. Polad Əsgər oğlu Məmmədov (1968-1991)
4. Rafiq Həsən oğlu Orucov (1972-1992)

**Qorçu kəndi.**

Qorçu kəndinin adı haqqında müxtəlif anlamlar söylənilir, əslində isə bu sözün türk sözü olduğu Qorçu anlamını verməsi tarixi mənbələrdə öz əksini tapmışdır. Xorçilər Çingiz xanın qvardiyası olub onu mühafizə etmək məqsədi daşıyırdı. Məlumdur ki türk dillərində qur sözü "silah" mənasında Qurçu sözünün əsgər mənası daşıması tamamilə təbiidir. Qorçilər Teymur dövründə əkin sahələrini qoruyurdular. Deməli mühüm dövlət əhəmiyyəti olan işi yerinə yetirirdilər. Osmanlı türklərində qorçi qarnizon xidmətində olanlara və meşə gözətçilərinə deyirdilər.

Ş.Fərzəliyev "Azərbaycan XV-XVI əsrlərdə" əsərində tarixi mənbələrə əsaslanaraq qorçilər haqqında aşağıdakı məlumatı verir: "Qorçilər Azərbaycanda XV əsrin əvvəllərində Sultan Əhməd Cəlayirin Təbrizə hücumu zamanı müşahidə olunmuşdur. Onlar xüsusi zərli paltar geyərək əllərində müxtəlif silahlar tuturdular... Qorçilər mənsub olduqarı yer və tayfanın adı ilə adlanırdılar. Qoçilər yalnız Qızılbaş birliyinə daxil olan tayfalardan götürüllürdülər" (15, 123)

Buradan bir daha aydın olur ki, Qorçilər Qızılbaş türk tayfalarndan formalaşmışdır. Onlar qoruyucu əsgər vəzifəsini yerinə yetirmişlər. Həmçinin Qorçilər bir tayfa kimi formalaşmışlar və yaşadıqları ərazi isə Qorçu adlandırılmışdır.

Qorçu kəndi rayon mərkəzindən 72 km. şimal qərbdə yerləşir. Kənddə orta məktəb, kitabxana, klub, çörəkbişirmə sexi, tibb məntəqəsi və mağaza var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Osman Muğan oğlu Xəlilov (1967-1994)
2. İlyas Nəriman oğlu Şahvələdov

**Qarabəyli kəndi.**

Rayon mərkəzindən təxminən 66 km. şimal qərbdə yerləşir. Orta məktəb, kitabxana, klub, tibb məntəqəsi və rabitə qovşağı var idi. Əhalisi 386 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Vaqif Məhəmməd oğlu Salmanov (1948-1993)
2. Qırımxan Qardaşxan oğlu Novruzov (1972-1993)
3. Nadir Əli oğlu Əliyev
4. Nüşabə Məhəmməd qızı Əliyeva
5. Tural nadir oğlu Əliyev
6. Mübariz Bəhrəm oğlu Əsgərov (1968-1193)

**Qozlu kəndi.**

Rayon mərkəzindən təxminən 30 km. şimal qərbdə yerləşirdi. İbtidai məktəb, kitabxana, klub və mağazası var idi. Əhalisi 183 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. İslam İdris oğlu Quliyev (1957-1992)

**Qazıdərəsi kəndi.**

Rayon mərkəzindən təxminən 25 km. cənubda yerləşirdi. Kəndin tibb məntəqəsi, rabitə şöbəsi, kitabxana, klub və iki mağazası var idi. Əhalisi 247 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehl*əri.

1. Cavanşir Cəmil oğlu Ağayev (1975-1994)
2. Fazil Cəlil oğlu Ağayev (1968-1992)

**Qoşasu kəndi.**

Rayon mərkəzindən təxminən 50 km. qərbdə yerləşirdi. Orta məktəb, mədəniyyət evi, tibb məntəqəsi, internat məktəbi, çörəkbişirmə sexi, rabitə şöbəsi, kitabxana, klub və mağazası var idi. Əhalisi 575 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehl*əri.

1. Zakir Sabir oğlu İbrahimov (1960-1992)
2. Şahvələd Əmir oğlu Cəbrayılov (1975-1995)

**Qışlaq kəndi.**

Rayon mərkəzindən təxminən 26 km. cənubda yerləşirdi. Əhalisi 180 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehl*əri.

1. Məhəmməd Dadaş oğlu Quliyev (1950-1992)

**Qovuşuq kəndi**

Rayon mərkəzindən təxminən 70 km. qərbdə yerləşirdi. Məktəb, kitabxana, klub, telefon dayaq məntəqəsi, çörəkbişirmə sexi, 2 mağazası var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Həmid Xudu oğlu Xəlilov (1968-1994)

**Lolabağırlı kəndi**

Rayon mərkəzindən təxminən 75 km. şimal qərbdə yerləşirdi. İbtidai məktəb, kitabxana, tibb məntəqəsi və mağazası var idi. Əhalisi 395 nəfərdir.

Kəndin adını Lələbağırlı, Lölöbağırlı adlandıranlar səhv edirlər. Çünki kəndin adı Bağır kişinin oğlu öldüyü üçün lola deyib ağlaması ilə bağlı olaraq yaranıb və Lolabağırlı adlandırılıb.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Qənəhət Ələsgər oğlu Quliyev (1944-1994)

**Qılışlı kəndi.**

Rayon mərkəzindən təxminən 40 km. məsafədə yerləşir. Əhalisi 168 nəfərdir. İbtidai məktəb və kitabxanası var idi. Kəlbəcər rayonunda, hətta Ermənistanda da eyni adlı kənd vardır. Məncə, bu kəndin adı tayfa adı ilə bağlıdır, yəni «qılınc» tayfasının məskunlaşdığı əraziyə Quluşlu və yaxud Qılınclı adını vermişlər.

**Qarıkaha kəndi.**

Rayon mərkəzindən iki km. şimal qərbdə yerləşir. Burada orta məktəb, kitabxana, klub, çörək bişirmə sexi, pavlion, tibb məntəqəsi, poçt və xalçaçılıq sexi var idi. Əhalisi 920 nəfərdir. Qarıkaha kəndinin adındakı qarı sözü qədim, ulu, müqəddəs anlamlarında işlənmişdir. Bu kənd qədim yaşayış məntəqələrindən biri olmuşdur.

**Qurdqajı kəndi.**

Rayon mərkəzindən 43 km. şimal qərbdə yerləşir, Qarabağ silsiləsinin cənub qərb yamacındadır. Orta məktəb, kitabxana, rabitə qovşağı və xəstəxanası var idi. Əhalisi milliyətcə Azərbaycanlılardan ibarətdir və 500 nəfərdir. Bu kəndin adı hal-hazırda rəsmi sənədlərdə Kürdhacı kimi qeyd edilir. Lakin əslində kəndin adı Qurdqacıdır. Azərbaycan Dövlət Tarix arxivi 69 saylı fondda «Şuşa bəy komissiyası, 1873» qeydi ilə saxlanılan sənəddə bu kəndin adı «Qurdhacı» kimi göstərilmişdir. Bu da yanlış bir ifadədir. Çünki millətin adından sonra hacı sözünü işlətmək olmaz.

Türkhacı, rushacı ola bilmədiyi kimi kürd və yaxud qurdhacı da ola bilməz. Həmçinin haca gedən şəxsin titulu onun adının əvvəlində işlənir, onun təyinedicisi kimi çıxış edir. (Hacı Sam, Hacı İslam) Odur ki, bu kəndin əsil adı Qurdqacıdır. Anlamı isə qurd yığnağı, qurdlar məkanı deməkdir. Qədim dövrlərdə türkləri qurd adlandırmışlar. Əbülqasim Firdovsi isə türklərin yaşadığı ölkəni «qurdlar ölkəsi» adlandırmışdır. Beləliklə, lap qədimdən qurd türk millətinin onqonu sayılmışdır. Odur ki, Qurdqajı kəndinin adı da qurdlar yığnağı, türklər yaşayan məkan mənasını ifadə edir. Burada ikinci komponent olan «qaj», bəzən «qəj» şəklində ifadə olunur və yığnaq, hissə, koma və s. anlamları bildirir.

Qac kompanenti burada topa, yığnaq mənasında işlənir. Bu gün də dilimizdə işlənir. Məsələn, bir qaj və yaxud qəj göy əkmişəm deyirlər.

Bu kəndin adının Qurdqajı olduğunu sübut edən sənət Respublika Dövlət tarix arxivində 123-cü fondun 7 saylı işin 155-169-cu səhifələrində özünü qoruyub saxlayır. Orada bu kəndin adı «Kurt qadjı» yəni Qurdqajı olduğu qeyd olunmaqla bərabər kəndin bəyi isə Davud bəy Ağalarov olduğu göstərilir. Bu qeydiyyat 1848-ci ildə qələmə alınmışdır.

Bu kənd qədim yaşayış məskəni olmuşdur. Burada «Vəzzoxlar», «Şiney dağı», «Bəzir yeri», «Bəzirxana» kimi yer adları qədim alban dövrü ilə səsləşən anlamlarda özünü göstərir. Bəzirxana adlanan yerdə Bəzir dəyirmanı var idi. Bu dəyirmanda zəyərək bitkisindən yağ istehsal edirmişlər. Ona görə də xalq arasında belə bir ifadə formalaşmışdır: «Zərb zəyərəkdən yağ çıxarar» belə bir dəyirman Kiş dağında da var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Azərbaycanın Milli Qəhrəmanı Ələsgər Xanlar oğlu Novruzov
2. Xəqani Həsən oğlu Axundov (1950-1993)

**Dəyhan kəndi.**

Rayon mərkəzindən 54 km. cənubda yerləşirdi. Burada ibtidai məktəb, kitabxana, klub, mağaza var idi. Əhalisi 274 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. İsa Zeynal oğlu Bilalov (1915-1992)
2. Taleh Cəmil oğlu Cabbarov (1971-1994)

**Əyrək kəndi.**

Bu kəndin adı «Dədə Qorqud» eposunda olan Əgrək adını yaşadır. Uşun Qoca oğlu Səgrəyin boyunda göstərilir ki, ulu oğlunun adı Əgrək idi. («Kitabi-Dədə Qrqud», Bakı-1962, səh. 131.)

«Dədə - Qorqud» boyları obrazlarının Qazan, Qambecan Baybecan, AqaraqƏkərək adları VII yüzillikdən çox qabaq Azərbaycan xalqının soykökündə duran qəbilə, qəbilə birləşmələrinin mifik görüşləri ilə bağlı adlar olmuşdur. Zaman keçdikcə dəqiq deyilsə, V-VII yüzilliklərdə, ola bilsin ondan da qabaq «Qazan xan» tarixi şəxsiyyət adı kimi, Qambecan Baybecan, Aqaraq Əkərək, yer, çay, qala adı kimi işlənmişdir». (M.Seyidov «Azərbaycan xalqının soykökünü düşünərkən», Bakı-1989, səh. 128)

**Əhmədli kəndi.**

Bu kənd Molla Əhmədin adını daşıyır. Rayon mərkəzindən təxminən 57 km. qərbdə yerləşirdi. Əhalisi 1012 nəfərdir. Burada orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, rabitə şöbəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Cavanşir Hacif oğlu Cabbarov (1967-1992)
2. Əlövsət Əbülfət oğlu Eyvazov (1959-1992)
3. Şamil Qabil oğlu Nəcəfov (1970-1992)

**Dambulaq kəndi.**

Rayon mərkəzindən təxminən 58 km. şimal qərbdə yerləşirdi. Əhalisi 689 nəfərdir. Orta məktəb, kitabxana, klub, və mağazası var idi.

Rəvayətə görə seyid Alı xəlifə çəliyini yerə vurmaqla damın içindən bulaq qaynayıb. Həmin bulaq damın içindən çıxdığı üçün bu əraziyə Dambulaq adı vermişlər.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Əhliman Əvəz oğlu Əsgərov (1941-1994)

**Daşlı kəndi.**

Rayon mərkəzindən 55 km. şimal qərbdə, Çalbayır silsiləsinin ətəyində, Şəlvə çayının (Həkəri çayının qolu) sahilində yerləşir. Əhalisi 932 nəfərdir. Orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, rabitə şöbəsi, dəyirman, çörəkbişirmə sexi və üç mağazası var idi.

Daşlı kəndi daşla əhatə olunmuş, çınqıl daşlı bir yerdə salındığına görə Daşlı adlandırılmışdır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Elşad Lətif oğlu Həsənov (1972-1993)
2. Xəlil Qədir oğlu Həsənov (
3. Təvəkgül Baxış oğlu Əmirov (1954-1992)
4. Raya Qabil qızı Əmirova (1959-1992)
5. Silduz Arif oğlu Tağıyev (1974-?)

**Ərikli kəndi.**

. Rayon mərkəzindən 50 km. şimal qərbdə, Qarabağ silisiləsinin cənub qərb yamacındadır. Əhalisi 800 nəfərdir. Orta məktəb, kitabxana, tibb məntəqəsi, çörəkbişirmə sexi və mağazası var idi.

Bu kəndin adı Sisian rayonunda olan Ərikli kəndinin, Sisian rayonunu ermənistandan ayıran silsilə Ərikli dağlarının və Ərikli çayının adından götürülmüşdür. Ərikli sözünün leksik anlamı ərənlər, igidlər yaşayan məkan mənasındadır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Şahin Əli oğlu Abbasov
2. Vahid Qara oğlu Sevindikov
3. Yaşar Vahid oğlu Sevindikov
4. Ərşad Qara oğlu Sevindikov
5. Məcnun Zaman oğlu Zamanov.
6. Çingiz Allahverdi oğlu Şükürov
7. Fazil Azay oğlu Abdullayev
8. Şirin Səməd oğlu Şirinov
9. Hüseyn Ismayıl oğlu Hüseynov
10. Əzizə Alış qızı Hüseynova
11. Güldəstə Qiyas qızı Ağamalıyeva (1940-?)

**Ələkçi kəndi.**

Rayon mərkəzindən 75 km. şimal qərbdə yerləşir. Əhalisi 554 nəfərdir. Burada mağaza, kitabxana və tibb məntəqəsi var idi. Ələkçi kəndinin adını yerləşdiyi şəraitlə bağlı olaraq əlin içi mənasında izah edirlər, yəni bu kənd hər tərəfdən təpə və dağla əhatə olunmuşdur. Odur ki, əlin içi kimi dərənin içində yerləşir. Buna görə də buraya əlin içi-Ələkçi adını veriblər. Amma belə bir yozum da var ki, bu kəndin adı Ələkçi tayfasının adından götürülübdür.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Azərbaycanın Milli Qəhrəmanı Fazil Umud oğlu Mehdiyev (1966-1991)
2. Qənaət Əkbər oğlu Quliyev (1954-1992)

*Itgin düşənlər.*

1. Nəbi Əbülfət oğlu Hümbətov (1972- )
2. Tanrıverdi Allahverdi oğlu Mehdiyev (1937- )

**Ərdəşəvi kəndi.**

Rayon mərkəzindən 55 km. şimal qərbdə yerləşirdi. Əhalisi 1187 nəfərdir. Burada orta məktəb, kitabxana, klub, musiqi məktəbi, rabitə şöbəsi, çörəkbişirmə sexi, 2 mağaza var idi.

Azərbaycan Dövlət tarix arxivi 69 saylı fond «Şuşa bəy komissiyası 1873» qeydi ilə saxlanılan sənəddə Ərdəşəvi kəndinin adı «Ərdəşova» kimi göstərilmişdir. Ərdəş türk tayfasıdır. Ərdəş evi, Ərdəş əvi, Ərdəş obası – Ərdəş tayfasının yaşadığı məkan anlamındadır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri və girov, itgin düşənlər.*

1. İslam İsmayıl oğlu Bağırov (1948-1992)
2. Yusivəli Hətəm oğlu Paşayev (1926-?)
3. Səlim kərim oğlu Həsənov (1962-1992)
4. Araz Ələsgər oğlu Həşimov (1975-1994)
5. Ədalət Səhliyalı oğlu Mirzəyev (1972-1994)
6. Qoşnalı Səlim oğlu Qoşnalıyev (1939-1992)

**Ərəb Unannovu kəndi.**

Bu kənd kiçik bir yaşayış məntəqəsidir. 75 nəfər əhalisi var. Amma Azərbaycan Respublikasının Milli Qəhrəmanı Israfil Şahverdi oğlu Şahverdiyev bu kənddə dünyaya göz açmışdır. (1952-1994) onun qardaşı Rəsul Şahverdi oğlu Şahverdiyev də 1995-ci ildə şəhid olmuşdur.

**Fərəcan kəndi.**

Rayon mərkəzindən 40 km. cənubda yerləşir. Əhalisi 469 nəfərdir. Burada orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, rabitə şöbəsi, 2 mağaza var idi.

*Kəndin qan yaddaşı.*

1. Kərəm Əyyub oğlu Zeynalov (1967-1992)
2. Salman Əyyub oğlu Zeynalov (1965-1994)

3. İlham Hüsü oğlu Orucov (1971-1994)
4. Əsgərxan Əziz oğlu Məmmədov (1939-1993)
5. Məcid Məmməd oğlu Hüseynov (1960-1994)
6. Bəbir Bəşir oğlu Ələkbərov (1969-1992)

**Zağaltı kəndi.**

Rayon mərkəzindən 60 km. şimal qərbdə yerləşirdi. Əhalisi 543 nəfərdir.

*Kəndin qan yaddaşı.*

1. Əliqulu Tohid oğlu Isgəndərov.

**Zabux kəndi.**

Rayon mərkəzindən 16 km. cənubda Zabux çayının sahilində yerləşirdi. Əhalisi 701 nəfərdir. Orta məktəb, klub, kitabxana, kinoqurğu, tibb məntəqəsi, rabitə şöbəsi var idi.

Zabux kəndi ərazisində orta əsrə aid Sümüklü qəbiristanlığı vardır. Tarixi həqiqətləri yaşadan bu tarixi abidələr əcdadlarımızdan bizə gəlib çatan daşlaşmış yaddaş muzeyidir.

*Kəndin qan yaddaşı.*

1. Ədalət Həsən oğlu Məmmədov (1962-1993)
2. Cəbrayıl Məhiyyəddin oğlu Vəliyev (1979-1993)

**İmanlar kəndi.**

Rayon mərkəzindən 62 km. şimal qərbdə yerləşir. Əhalisi 412 nəfərdir. Burada əsas məktəb, klub, kitabxana, iki mağaza və telefon dayaq məntəqəsi var idi.

*Kəndin qan yaddaş şəhidlik zirvəsinin fatehləri.*

*1.*Vüqar Cavanşir oğlu Niftalıyev (1966-1993)

**Kalafalıq kəndi.**

Rayon mərkəzindən təxminən 56 km. şimal qərbdə yerləşir. Əhalisi 300 nəfərdir. Burada əsas məktəb, kitabxana və mağaza var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehi.*

1. Rza Cəlal oğlu Sadıqov (1960-1989)

**Kaha kəndi.**

Rayon mərkəzindən təxminən 65 km. şimal qərbdə yerləşir. Əhalisi 284 nəfərdir. Burada orta məktəb, kitabxana, klub və mağaza var idi.

**Katos kəndi.**

Rayon mərkəzindən 58 km. şimal qərbdə yerləşir. Əhalisi 321 nəfərdir. Orta məktəb, kitabxana, uşaq bağçası və mağazası var idi.

Kəndin ağsaqqalları söyləyirlər ki, 1750-ci illərdə bu əraziyə tədqiqatçı qruppası gəlir. Bu qruppanın başçısı isə Katovski soyadını daşıyırmış. Bu ərazini onlar tədqiq etdiyinə görə burada salınmış kəndi Katovskinin şərəfinə təhrif olunmuş şəkildə, yəni savadsız kənd camaatının tələffüzünə uyğun formada Katos adlandırmışlar.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. İlqar Mustafa oğlu Mustafayev (1968-1993)
2. Vasili Hüseyn oğlu Şahməmmədov (1955-?)
3. Cümşüd Həsənxan oğlu Məmmədov (1962-?)
4. Mədət Əvəz oğlu İbişov (1933-?)
5. Elyana Mədət qızı İbişova (1968-?)

**Güləbird kəndi.**

Rayon mərkəzindən 30 km. cənub şərqdə yerləşirdi. Əhalisi 1660 nəfərdir. Orada orta məktəb, Xəstəxana, mədəniyyət evi, kitabxana, rabitə şöbəsi və iki mağaza fəaliyyət göstərirdi.

Zənnimcə, Güləbird sözü Çiləbörd, Çəlvird sözü ilə eyni kökdəndir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Azərbaycanın Millə Qəhrəmanı Qorxmaz Abış oğlu Eyvazov (1967-1994)
2. Rizvan Humay oğlu Hümbətov (1954-1992)
3. Alış Aydın oğlu Allahverdiyev (1969-1992)
4. Şəmşir Şahmar oğlu Abbasov (1967-1992)
5. İlyas Vaqif oğlu Cabbarov (1968-1993)
6. Əfqan Xanış oğlu Qorçuyev (1970-1994)
7. Gəray Azad oğlu Məmmədov (1969-1993)
8. İsaq Savalan oğlu Məmmədov (1963-1992)
9. Əhliman Dadaş oğlu Quliyev (1961-1992)
10. Ilham Allahverdi oğlu Nəzərov (1963-1994)
11. Mustafa Babalar oğlu Abbasov (1954-1995)
12. İslam Xanış oğlu Abbasov (1973-1994)

**Minkəd kəndi.**

Laçın rayonundakı Minkənd oykoniminin də paralelləri az deyildir. Bəzi tədqiqatçılar kəndin adını min sözünün say mənası ilə bağlayırlar. Yerli xalq etimologiyasına görə, bu kənd Teymurləngin Azərbaycana yürüşü zamanı tutduğu mininci kənd olmuşdur. Lakin Rayon mərkəzindən təxminən 54 km. qərbdə yerləşirdi. Əhalisi 1012 nəfərdir. Burada orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, rabitə şöbəsi var idi. Lakin Minkənd toponiminin paralellərini öyrəndikdə bu, inandırıcı görünmür. Çünki Özbəkistanda Minq, Minqlər, Kattaminq, Minkişlaq, Tacikistanda Minqistan, Munkent, Cənubu Azərbaycanda Minq, Minabad kəndləri vardır. I.Şopen Ordubadda Minoiz Məhəllə adını qeyd edir. (türk-monqol dillərində «z» cəmlik bilidirir. Minqiz-yəni «minqlər»). XVIII-XIX əsrlərdə indiki Başqırdıstan ərazisində Minsk, Sart-Minsk volostları və Staroe Mineqo kəndi mövcud olmuşdur. Hələ XI əsrdə Mahmud Kaşqari özünün «Divani lüğət-it-Türk» əsərində Minqlak yer adını çəkir. Göründüyü kimi bu toponimlər türkdilli xalqların yaşadıqları çox geniş

ərazidə yayılmışdır. Tarixi ədəbiyyatlarda türkdilli min (minq, minqat) etnonimindən geniş bəhs edilir. Min etnosu VII-VIII əsrlərdə toquzoğuz konfederasiyasına daxil olmuşdur. VIII-IX əsrlərdə bu tayfanın başqırdların arasında çəkilir. VII-VIII əsrlərdə minlər qıpçaqların, XIII-XIV əsrlərdə Qızıl Ordanın tərkibində böyük tayfa birləşməsi olmuşdur. Bütün bunlar göstərir ki, Minkənd və habelə onun qeyd edilən toponimik paralelləri min tayfasının geniş yayılaraq məskunlaşması ilə əlaqədar yaranmışdır». (16, 101)

Əjdər Fərzəli «Minkənd» toponiminin şərhinə isə başqa prizmadan yanaşır və özundən əvvəlki izahları qəbul etmir. O, yazır: «Girdiman-qoz od mandır, yəni uca Od xalqı. Minkənd də bu kökdəndir və yozulduğu kimi «sayca mininci kənd» deyil. Türkdilli «minqə» qəbilə adını da əks etdirmir, şəhər məzmunlu «kənd»ə yer qalmır. Minkənd isə məhz kənd olub. Əski oğuzlar kəndə-oba, şəhərə isə kənd-kand demişlər. Minkənd də bu baxımdan «Xalq şəhəri» adlanıb». (5, 87)

Minkənd kəndi rayon mərkəzindən 60 km. şimal qərbdə yerləşir. Əhalisi 2704 nəfərdir. Bu kənddə orta məktəb, klub, kitabxana, xəstəxana, kinoqurğu kompleksi, rabitə şöbəsi, müxtəlif çeşidli 3 mağaza var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehlərivə itgin, girov düşənlər.*

1. Vaqif Xasay oğlu Babayev (1969-1992)
2. İsrafil Xasay oğlu Hümbətov (1939-1992)
3. Şəfa Abduləli oğlu Qədmalıyev (1959-1991)
4. Bayram Məhəmməd olu Məmmədov (1970-1992)
5. Faiq Nəriman oğlu Məmmədov (1973-1994)
6. Valeh Məhəmməd oğlu Muradəliyev (1934-1992)
7. İsa Oruc oğlu Təhməzov (1955-1992)
8. Hidayət Möhbalı oğlu Təhməzov (1939-1992)
9. Sumayə Həsən qızı Səfərəliyeva (1960- )
10. Xosrov Yaqub oğlu Baramov (1941- )
11. Qurban Qaraxan oğlu Məmmədov (1972- )
12. Nərgiz Bayram qızı Məmmədova (1960- )

13. Ceyran Sultan qızı Məmmədova (1962- )
14. Muxəstə Məhərrəm qızı Məmmədova (1980- )

**Mişni kəndi.**

Rayon mərkəzindən təxminən 30 km. qərbdə, Həkəri çayının sol sahilindədir. Burada Tunc və dəmir dövrünə aid Govur qala adlanan tarixi qala vardır. Əhalisi 1248 nəfərdir. Kəndin orta məktəbi, klubu, xəstəxanası, rabitə qovşağı və kitabxanası var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Vüqar Qənbər oğlu Aslanov (1970-1994)
2. Habil Yunis oğlu Həsənov (1974-1993)
3. Ərəstün Əhməd oğlu Kərimov (1959-1993)

**Mığıdərə kəndi.**

Rayon mərkəzindən təxminən 24 km. cənub qərbdə, Qarabağ silsiləsinin cənub şərq ətəyindədir. Əhalisi 245 nəfərdir. Burada orta məktəb, klub, kitabxana və xəstəxana var idi.

**Mayıs kəndi.**

Rayon mərkəzindən təqribən 28 km. qərbdə yerləşir. Əhalisi 287 nəfərdir. Klub, kitabxana, və mağazası var idi. Mayıs türk sözü olub güllü, çiçəkli mənasını verir, həmçinin may ayı deməkdir .

*Kəndin qan yaddaşına itgin düşmüş Ədil Məmiş oğlu Heydərov həkk olunmuşdur.*

**Oğuldərə kəndi.**

Rayon mərkəzindən təxminən 70 km. şimal qərbdə yerləşir. Əhalisi 1314 nəfərdir. Orta məktəb, kitabxana, klub, pekarnı, mağaza və uşaq bağçası var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Teymur Zülfüqar oğlu Ibrahimov (1921-1993)
2. Ağaşirin Teymur oğlu Ibrahimov (1958-1993)
3. Xəqani Vaqif oğlu Məcnunov (1974-1993)
4. Mötəbər Dadaş oğlu Ibrahimov (1954-1993)
5. ibadət Nəcəf oğlu Nəcəfov (1972-1993)
6. Pənah Balay oğlu Məmmədov (1973-1993)

**Malıbəy kəndi.**

Rayon mərkəzindən təxminən 30 km. şimal qərbdə yerləşirdi. Orta məktəb, kitabxana, klub, rabitə şöbəsi, çörəkbişirmə sexi, tibb məntəqəsi və iki mağazası var idi. Əhalisi 713 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Şəfa Səməd oğlu Abdullayev (1968-1991)

**Mirik kəndi.**

Rayon mərkəzindən təxminən 40 km. şimal qərbdə yerləşirdi. Orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, kinoqurğu var idi. Əhalisi 1134 nəfərdir. Kənd Mirik qalasının yerləşdiyi sahədə salındığına görə Mirik adlandırılıb. Ehtimal olunur ki, Mirik marıq sözündən olub, güdükçü, yəni müşahidə edən deməkdir. Xalq arasında marıq sözü bu gün də işlənir. Məsələn:

- Ölübdü Niftalı, qocalıb Alı
Marıqda durubdu cavan Mehralı.
Qırxqızın dağları, səndən soruram
- Alıbəy, Mustafa, Əlabbas hanı?!

Mirik kəndinin yerləşdiyi ərazidə XV əsrə aid tarixi abidələr vardır. Bu abidələr kəndin qədim yaşayış məskəni olduğunu bir daha sübut edir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri və girov, itgin düşənlər.*

1. Şərif Müzəffər oğlu Şərifov (1968-1993)
2. Hamlet Kərim oğlu Həşimov (1968-1994)
3. Sərdar Əli oğlu Nəcəfalıyev (1950-?)

**Mollalar kəndi.**

Rayon mərkəzindən təxminən 14 km. şimal qərbdə yerləşirdi. Kəndin ibtidai məktəbi, kitabxanası, klubu var idi. Əhalisi 108 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Əsgərxan Ismayıl oğlu Abışov (1951-1994)
2. Aydın Şərif oğlu Mustafayev (1926-?)
3. Xanım Fərhad qızı Mustafayeva (1920-?)
4. Əliqulu Aydın oğlu Mustafayev (1969-?)
5. Qızbəst Əmrah qızı Quliyeva (1910-?)
6. Sahib Bayram oğlu Quliyev (1967-?)

**Nağdalı kəndi.**

Rayon mərkəzindən 76 km. şimal qərbdə yerləşir. Əhalisi 1099 nəfərdir. Burada orta məktəb, xəstəxana, kitabxana, klub, əmanət kassası, musiqi məktəbi, mədəniyyət evi və poçt var idi.

Kəndin adı nəqdi almaq (nağdı almaq) kimi anlamda işlənir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Abdulla Bədəl oğlu Abdullayev
2. Fərman Abdulla oğlu Abdullayev
3. Səadət Abdulla qızı Abdullayeva
4. Əvəz Baxşeyiş oğlu Cəfərov
5. Səmayə Aydın qızı Kərimova
6. Hümbət Əbülqasım oğlu Mehdiyev
7. Qənirə Ibrahimxəlil qızı Mehdiyeva
8. Fikrən Hümbət oğlu Mehdiyev

9. Ayna Hümbət qızı Mehdiyeva
10. Mehdi Hümbət oğlu Mehdiyev
11. Rəhbər Məhəmməd oğlu Mehdiyev
12. Nübar Muradzın qızı Mehdiyeva
13. Gülayə Əli qızı Mehdiyeva
14. Sürayə Məhəmməd  qızı Mehdiyeva
15. Səfər Azad oğlu Mirzəyev
16. Hürzaman Qara qızı Hümbətova.
17. Elçin Vəzir oğlu Hümbətov
18. Ismayıl Vəzir oğlu Hümbətov
19. Nəbati Vəzir qızı Hümbətova.
20. Bəxtiyar Vəzir oğlu Hümbətov
21. Gülxar Vəzir qızı Hümbətova.
22. Elnur Vəzir oğlu Hümbətov
23. Eyvaz Vəzir oğlu Hümbətov
24. İsa Qılman oğlu Həşimov
25. Qənahət Əkbər oğlu Quliyev
26. Bəyim Aydın qızı Mehdiyeva

İtgin düşənlər.

1. Yusif Pənah oğlu Əliyev (1938-?)
2. Asif Pənah oğlu Əliyev (1954-?)
3. Hənifər Zülfüqar qızı Əliyeva (1938-?)

**Pircahan  kəndi.**

Rayon mərkəzindən təxminən 35 km. qərbdə yerləşirdi. Burada orta məktəb, Mədəniyyət evi, kitabxana, xəstəxana, çörəkbişirmə sexi, pendir zavodu, rabitə şöbəsi və iki mağaza var idi. Əhalisi 479 nəfərdir. Bu ərazidə XI əsrə aid «Gavur qalası» adlanan tarixi abidə vardır. Kənd qədim pir olan yerdə salındığına görə prcahan adlandırılıb.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Semur qəhrəman oğlu Ağakişiyev (1972-1993)
2. Vüqar Mehdiqulu oğlu Həsənquliyev (1974-1993)
3. İman Mehdiqulu oğlu Həsənquliyev (1966-1993)
4. Bəhmən Çərkəz oğlu Səfərəliyev (1961-1992)
5. Səməd Kərim oğlu Səmədov (1972-1993)
6. Mehdi Həmdəm oğlu Rüstəmov (1956-1993)

**Soyuqbulaq kəndi.**

Rayon mərkəzindən təxminən 30 km. şimal qərbdə yerləşirdi. Burada məktəb, kitabxana, mağaza var idi. Əhalisi 260 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. İlyas Veysəl oğlu Ilyasov (1972-1993)

**Seyidlər kəndi.**

Rayon mərkəzindən təxminən 32 km. qərbdə yerləşirdi. Burada məktəb, kitabxana, klub, rabitə şöbəsi və mağaza var idi. Əhalisi 181 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Oktay Asif oğlu Abdullayev (1975-1994)
2. Elxan Kərim oğlu Məmmədov (1962-1991)
3. İbrahim Mehdi oğlu Abdullayev (1923-?)

**Səfiyan kəndi.**

Rayon mərkəzindən təxminən 40 km. cənubda yerləşirdi. Burada 8-illik məktəb, klub, kitabxana, rabitə şöbəsi və mağaza var idi. Əhalisi 290 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Həsən Şahmar oğlu Qorçuyev (1962-1992)
2. Rəhman Əhliman oğlu Həsənov (1972-1992)
3. Əvəz Hüseyn oğlu Isgəndərov (1972-1994)

**Suarası kəndi.**

Rayon mərkəzindən təxminən 30 km. cənubda yerləşirdi. Burada ibtidai məktəb, kitabxana, klub və mağaza var idi. Əhalisi 178 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Müşfiq bəhmən oğlu Kərimov (1971-1994)

**Aşağı Çorman kəndi.**

Rayon mərkəzindən təxminən 56 km. şimal qərbdə yerləşir. Əhalisi 323 nəfərdir. Burada əsas məktəb, uşaq bağçası, və tibb məntəqəsi var idi.

**Qarakeçdi kəndi.**

Rayon mərkəzindən 65 km. şimal qərbdə yerləşir. Əhalisi 2666 nəfərdir. Burada orta məktəb, klub, xəstəxana, mədəniyyət evi, uşaq bağçası, poçt, çörəkbişirmə sexi, və 7 mağaza var idi. Bu kənd əvvəllər Qarakeşiş adlanırda.

**Sadınlar kəndi.**

Rayon mərkəzindən təxminən 45 km. şimal qərbdə yerləşir. Əhalisi 377 nəfərdir. XVII əsrə aid tarixi olan abidələr kəndin mərkəzində yerləşirdi. Burada orta məktəb, mədəniyyət evi, uşaq bağçası, kitabxana, tibb mənətəqəsi və mağaza var idi..

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Qaçay Fərhad oğlu Allahverdiyev (1952-1991)
2. Nadir Şükür oğlu Orucov (1968-1992)
3. Cavanşir Sarı oğlu Ibrahimov (1936-1990)

**Sonasar kəndi.**

«Sona qəbiləsinin adı etnik mənbələrdə eradan qabaq çəkilir. Putolomey göstərir ki, Qafqazda Saona adlı çay var. K.V.Treverin fikrincə o, indiki Samurdur». (8, 65)

Quş onqonu bu toponimdə də özünü mühafizə etmişdir. Sonasar toponimi Sona kimi sar anlamında dərk olunmuşdur. Yəni Sar sona misallıdır, həmçinin alıcı quş deyildir. Amma aşağıdakı bayatıda belə bir duyum vardır:

- Mən Aşiq sər ovlar,
Sər çeşmələr, sər ovlar,
Tülək tərlan yerində
Onda gördüm sar ovlar.

Əcdadlarımız ən müqəddəs varlıqlardan saydığı və halalım, dirəyim, döləyim adlandırdığı həyat yoldaşını, sevgilisini sonaya bənzətmişdir. Aşağıdakı bayatılarda bunu aydın görə bilərik:

Mən Aşiq çil ovlar
Çil kəkliyi çil ovlar
Burdan bir sona keçdi
Əldə qaldı çilovlar.

Mən Aşiq çil ovlar
Çil kəkliyi çil ovlar
Sonanın tərlanı var
Ye, qalmasın çilovlar.

Sonasar kəndi Laçın şəhərindən 24 km. şimal qərbdə yerləşir. Əhalisi 308 nəfərdir. Əsas məktəbi, klubu, mədəniyyət evi, rabitə şöbəsi, kitabxana, tibb mənətəqəsi və mağaza var idi..

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Mətləb Museyib oğlu Muradov (1966-1993)

**Tığik kəndi.**

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Bahadur Bulud oğlu Cəfərov (1968-1994)
2. Azər Qələndər oğlu Paşayev (1974-1993)

**Tərxanlı kəndi.**

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Etibar Əvəz oğlu Məmmədov (1967-1994)

**Təzəkənd kəndi.**

Rayon mərkəzindən 39 km. şimal qərbdə yerləşir. XVII əsrə aid tarixi olan abidələr kəndin mərkəzində yerləşirdi. Burada klub, kitabxana, xəstəxana var idi. Əhalisi 300 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Elşən Qənbər oğlu Süleymanov

*Uludüz kəndinin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Teyyub Salah oğlu Şükürov (1959-1993)
2. Elxan Salah oğlu Şükürov (1958-1992)

**Zerti kəndi**

Rayon mərkəzindən 6 km. şimal qərbdə yerləşirdi. Məktəb, kitabxana, klub, rabitə şöbəsi var idi. Əhalisi 218 nəfərdir. Zerti sözünün anlamını Əjdər Fərzəlinin «Dədə Qorqud yurdu» əsərinə əsasən çözə bilərik. «Musa Qağanqaytuqlunun məşhur «Alban tarixi»ndə rast gəldiyimiz «Yer» mənasında şərh edilən «zer» komponenti ilə eyni məzmuna malikdir. deməli, ibtidai azərbaycanlı zer-zər dedikdə həm «od», həm də «odlu torpaq» düşünmüşdür. Zer yer anlamındadır». (Səh. 11)

*Kəndin qan yaddaşı.*

1. Musa Alı oğlu Süleymanov (1910-1993)
2. Manya Salman qızı Vəliyeva (1950-1992)

**Farraş kəndi.**

Rayon mərkəzindən 70 km. şimalda yerləşirdi. Əhalisi 226 nəfərdir. Orada ibtidai məktəb, kitabxana, tibb məntəqəsi və mağaza var idi. «Avesta» dilində «faraş» sözü tez anlamında işlənmişdir. Bu gün dilimizdə işlənən «farraş» sözü də həmin anlamda işlənir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Miryusif Kərim oğlu Orucov (1948-1988)
2. Rafiq Miryusif oğlu Orucov (1972-1993)

**Fətəlipəyə kəndi.**

Rayon mərkəzindən təqribən 30 km. cənubda yerləşirdi. Məktəb, kitabxana, klub, tibb məntəqəsi və rabitə şöbəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Kamal Bəbəş oğlu Cabbarov (1968-1993)

**Xumarta kəndi.**

Rayon mərkəzindən təqribən 25 km. cənubda yerləşir. Xalq deyiminə əsasən bu kəndin əhalisi Cənubi Azərbaycanın Qaradağ mahalında yerləşən Xumarlı kəndindən gəlmişlər.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Kamal bəşir oğlu Səlimov (1937-1990)

**Birinci İpək kəndi.**

Rayon mərkəzindən təqribən 32 km. şimalda yerləşirdi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Vaqif Rzaqulu oğlu Quliyev (1956-1992_
2. Rəfail Surxay oğlu Quliyev (1974-1992)
3. Tahir Surxay oğlu Quliyev (1972- ?)

**Xanalılar kəndi.**

Rayon mərkəzindən təqribən 23 km. cənubda yerləşirdi. Kəndin ibtidai məktəbi və mağazası var idi. Əhalisi 147 nəfərdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Əziz Hüseyn oğlu Isgəndərov (1972-1994)

**Xırmanlar kəndi.**

Rayon mərkəzindən təqribən 15 km. şimalda yerləşirdi. Əsas məktəb, tibb məntəqəsi və mağazası var idi. Əhalisi 128 nəfərdir. Kəndin salındığı ərazi çoxlu xırmanlarla əhatə olunmuşdur. Xırman taxıl döyülən və buğda hasil olunan yerdir. Xırman-çoxlu xırı (xırda daşı) olan dəyirmi yerdir ki, burada vələ qoşulmuş öküzlər xırmana sərilmiş taxılın üstü ilə sürülür. Vəlin də altı xırda daşlarla dişlənmiş olur. Taxıl xırmanda əzilir və buğda samandan ayırd edilir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Elnur Zakir oğlu Cabbarov (1973-1994)

**Hətəmlər kəndi.**

Rayon mərkəzindən 65 km. şimal qərbdə yerləşir. Əhalisi 341 nəfərdir. Bu kənddə Əsas məktəb, kitabxana, klub və tibb məntəqəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1.Əli Cocu oğlu Abdullayev (1954-1995)

**Xaçınyalı kəndi.**

Rayon mərkəzindən 47 km. şimal qərbdə yerləşir. Əhalisi 172 nəfərdir. Bu kənddə ibtidai məktəb, klub var idi. Kiçik kənd olsa da vətənpərvər oğul yetişdirən ərənlər diyarıdır. Azərbaycanın Milli Qəhrəmanı Oqtay Güləli oğlu Güləliyev (1963-1992) bu kənddə doğulmuş, tərbiyə olunmuşdur.

**Hoçaz kəndi.**

Rayon mərkəzindən 20 km. şimal qərbdə yerləşir. Orta məktəb, kitabxana, klub, iki dəyirman, xəstəxana, üç mvğvzv, çörəkbişirmə sexi və rabitə qovşağı var idi. Əhalisi 611 nəfərdir. Hoçaz kəndinin yerləşdiyi yerdə qədim tarixi abidələr, «Anavad» adlanan alban kilsəsi var idi.

Hoçaz sözü Qamuz, Qomuz, Qobuz, Qoçaz-Qopuz kökünə bağlıdır. Q-h əvəzlənməsi nəticəsində Hoçaz kimi formalaşmışdır. Başqa bir yozuma görə Hoçaz sözü Hicaz sözündəndir ki, bu da musiqi ilə bağlıdır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri*

1. Kamil Qəni oğlu Məmiyev (1966-1992)
2. Bakir Rəşid oğlu Mehralıyev (1966-1992)
3. Asəf Qəni oğlu Məmiyev (1971-1992)
4. Saday Həsi oğlu Qiyasov (1971-1994)
5. Şərif Tahir oğlu Məmmədov (1969-1994)
6. Teyyub Çərkəz oğlu Musayev (1970-1991)
7. Əhməd Məhəmməd oğlu Şahbazov (1946-?)

**Hacısamlı kəndi.**

Rayon mərkəzindən 50 km. şimal qərbdə, şəlvə çayının (Həkəri çayının qolu) sahilindədir. Əhalisi 341 nəfərdir. Burada əsas məktəb, kitabxana, klub, kinao qurğusu, mərkəzi aprek, çörəkbişirmə sexi iki mağaza, tibb məntəqəsi və taxta emalı zavodu fəaliyyət göstərirdi. Taxta emalı zavoduna əsasən buraya çox vaxt «Zavod»-deyirdilər. Lakin kəndin adı Qaraqasımlı tayfasının ulu əcdadlarından olan Hacı Samın şərəfinə Hacısamlı adlandırılmışdır.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri*

1. Adil Calal oğlu Qasımov (1970-1992)

**Hacılar kəndi.**

Rayon mərkəzindən 47 km. qərbdə yerləşir. Əhalisi 926 nəfərdir. Orta məktəb, kitabxana, klub və tibb məntəqəsi var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri*

1. Allahverən Fərman oğlu Abdullayev (1946-1990)
2. Elçin Əhməd oğlu Məhərrəmov (1975-1996)
3. Qiyas Oruc oğlu Qəhrəmanov (1975-1996)

**Haqnəzər kəndi.**

Rayon mərkəzindən təqribən 58 km. şimal qərbdə yerləşirdi. Əhalisi 216 nəfərdir. Burada əsas məktəb, klub, kitabxana var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri*

1. Cahid Şikar oğlu Verdiyev (1974-1993)
2. Məhiyəddin Şükür oğlu Verdiyev (1969-1992)
3. Habil Qənimət oğlu Məmmədov (1976-1992)

**Cağazur kəndi.**

Rayon mərkəzindən təxminən 35 km. cənub qərbdə yerləşirdi. Əhalisi 733 nəfərdir. Bu kənddə orta məktəb, kitabxana, klub, tibb məntəqəsi, poçt, iki mağaza var idi. Cağazur sözünü bəziləri dəyirman dərəsi kimi izah etməklə bu sözü erməni sözü kimi izah edirlər. Lakin sözün iki komponentinin ikisi də milli sözlərimizdir. Cağ-mil, arabanın yanına vurulan nazik ağac mənasında işlənir. Dilimizdə işlənən cağbacağ sözündə özünü qoruyub saxlamışdır. Ikinci komponen isə sur-zur-zür haray məzmunu daşıyır. (Israfi surunu çalanda) Zurna-Surna sözləri də bu kökdəndir. Onda demək olar ki, zurnamız olanda erməni musiqi nə olduğunu anlamırdı. Bəs onda Cağazur sözü niyə erməni sözü olsun. Bəlkə, erməninin gözünə mil çəkən zaman

(Cağ da mil anlamını verir) haray salıb çığırdığı yer kimi bu adı izah etmək daha yaxşı olar.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri*

1. Əjdər Həsi oğlu Hüseynov (1954-1992)
2. Mayıl Musa oğlu Musayev (1954-1992)
3. Xəqani Xankişi oğlu Zeynalov (1958-1992)
4. Rasim Cəlal oğlu Bayramov (1968-1995)

**Çənbərəkənd kəndi.**

Rayon mərkəzindən təqribən 40 km. cənubda yerləşirdi. Burada ibtidai məktəb, kitabxana, klub və mağazası var idi. Bakıda da Çənbərəkənd adlanan yer və qəbiristanlıq vardır. Çənbər sözü dairəvi anlamında işlənir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Ərşad Saleh oğlu Ilyasov (1966-1992)

**Cicimli kəndi.**

Rayon mərkəzindən 32 km. cənubda yerləşir. Əhalisi 400 nəfərdir. Bu kəndin orta məktəb, kitabxana və tibb mətntəqəsi var idi. Bakıda dəbir dövrüna aid «Qız qəbri» kurqanı, orta əsrlərə aid «Çobandaş» memarlıq abidələri, XIV əsrə aid «Məlikəjdər» türbəsi vardır.

Belə bir yozum vardır ki, bu kəndin salındığı yerdə «Cicim» ocağı olduğuna görə (Cicim ocağı- nənə ocağı deməkdir) bu kəndi Cicimli adlandırıblar. «Cicim ocağı» xalq arasında müqəddəs yer sayılırdı. Oranın torpağından suyundan istifadə etməklə çətin sağalan yaraları, ağır xəstələri və quduzluğa tutulmuş insanları müalicə edirdilər. Xalq arasında bu ocağa böyük inam var idi.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Məzahir Sədi oğlu Ismayılov (1961-1994)
2. Mehdi Rüstəm oğlu Məmmədov (1937-1989)
3. Elman Qüdrət oğlu Yusifov (1970-1994)

4. Qafar Hüseyn oğlu Orucov (1976-1994_
5. Seymur Elmidar oğlu Cəbiyev (1976-1995)
6. Əhməd Məhəmməd oğlu Hümbətov (1965-1994)

**Şeylanlı kəndi.**

Rayon mərkəzindən 60 km. qərbdə yerləşirdi. Burada orta məktəb, kitabxana, rabitə şöbəsi və mağaza var idi. Əhalisi 1100 nəfərdir. Bu kəndin əhalisinin əksəriyyəti kürdlərdən ibarətdir. Odur ki, bu kəndin adı kürd dilində itburnu (buna bəzən həmərsin də deyirdilər) bitkisi ilə bağlıdır. Kənd itburnu bitkisi çox bitən bir sahədə salındığına görə buraya Şeylanlı deyiblər. Şeylan kürd dilində itburnu deməkdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Qəmzə Abbas qızı Əbilova (1927-1992)
2. Möhbalı Zeynalabdin oğlu Quliyev (1931-?)
3. Manaf Şəmil oğlu Mayılov (1973-?)
4. Şəmil Xəlil oğlu Mayılov
5. Nabat Polad qızı Quliyeva (1934-?)
6. Xankişi Qara oğlu Hümbətov

**Şamkənd kəndi.**

Rayon mərkəzindən 68 km. şimal qərbdə yerləşir. Əhalisi 457 nəfərdir. Orta məktəb, kitabxana, xəstəxana, klub çörəkbişirmə sexi və rabitə qovşağı var idi.

Bu kəndin adında olan Şam və kənd komponentlərinin leksik anlamı Şam şəhəri mənasını verir. Çünki qədim oğuzlarda kənd, kand şəhər deməkdir. Lakin bu ərazidə ilk dəfə Qaraqasımlı tayfasının ulu əcdadı sayılan Hacı Sam məskunlaşıbmış. Odur ki, bura Samın yaşadığı ərazi kimi Samkəndi adlanıbdı. Sonralar s-ş əvəzlənməsi nəticəsində Şamkən deyimində formalaşmışdır. Eyni ilə bu vəziyyəti H.Z.Şirvani Şam şəhəri haqqında müşahidə etmiş və vaxtilə yazmışdır: «…bəzilərinin söyləməsinə görə o yeri Sam ibn Nuh adlı bir şəxs abad etmişdir. Suriyalılar «s» hərfi

əvəzinə «ş» hərfi işlədib ona Şam demişdir». (17, 134) Şamkənd sözündəki «ş» hərfi də belə əvəzlənmənin nəticəsidir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Sarvan Məmməd oğlu Məmmədov (1968-1992)
2. İdris Həsən oğlu Həsənov

*İtgin düşənlər.*

1. Cahan Məşədi qızı Alışova (1937- )
2. Vəsilə Cəfər qızı Alışova (1967- )
3. Qumru Qənbər qızı Alışova (1973- )

## Şəlvə kəndi.

Rayon mərkəzindən 58 km. şimal qərbdə yerləşir. Əhalisi 768 nəfərdir. Orta məktəb, xəstəxana, mədəniyyət evi, kitabxana, klub, musiqi məktəbi, poçt, çörəkbişirmə sexi və iki mağazası var idi.

Bu kəndin adı burada ilk dəfə məskunlaşan Şəvə adlı kişinin adından götürülmüşdür. Şəvə sözü qara rəng mənasında işlənmişdir.

*Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri.*

1. Ənvər Şahverdi oğlu Şahverdiyev (1967-1992)

## AZƏRBAYCANA VƏ AZƏRBAYCANLILARA QARŞI YÜRÜDÜLƏN ERMƏNİ SİYASƏTİ VƏ ONUN FORMALARI.

Ermənilər nəyin bahasına olursa-olsun Qarabağda erməni siyasəti işlədərək Qarabağı özününküləşdirmək və bu ərazidə olan başqa millətləri məhv etmək onların mədəniyyətini, incəsənətini, ümumiyyətlə, nəyi varsa mənimsəmək üçün Qarabağa gəldiyi gündən bu məqsədlə cürbəcür iyrənc alçaqlıqlara əl atıblar. Qarabağın bəlalı günləri isə 1923-cü ildə rəsmiləşir. Həmin ildə DQMV təşkil olunur. Həmçinin həmin ildə erməni siyasətinin bir variantı kimi Azərbaycan ərazisində Qubadlı, Kəlbəcər və Laçın torpaqlarının vahid qəza kimi birləşməsi qərara alınır və Kürdüstan qəzası yaradılır. Talışlaşdırma, ləzgiləşdirmə, farslaşdırma və s. bütün bunlara yalnız bir ad vermək olar «erməni siyasəti».

Azərbaycanda tarixi yerlərin, şəhər və rayonların, kəndlərin erməniləşdirilməsi, ləzgiləşdirilməsi, talışlaşdırılması və s. erməni siyasətinin bir formasıdır. Laçın rayonunda da Alban və Türk adlarının sonradan dəyişdirilib başqa ad verilməsi tarixi saxtakarlıq və erməni siyasətinin davamıdır.

Bu proses 1923-cü ildən müxtəlif üsullarla 1992-ci ilə qədər davam etdirildi və nəticəsi də bütövlükdə Dağlıq Qarabağın (20% Azərbaycan ərazisinin) ermənilər tərəfindən işğalı ilə başa çatdı.

Türk adlarının saxtalaşdırılması ən azı bu xalqa xəyanətdir. Bu xəyanət Göyçənin-Vardanis, Basarkeçərin-Vardenis, Vedinin-Ararat, Göyçə gölünün-Sevan və s. adlandırılması silsiləsinə daxildir.

Yaşadığımız Laçın rayonu ərazisində çoxlu qədim abidələr, Alban məbədləri vardır. Bu abidələrə xüsusi qayğı göstərilməsə də, qorunub saxlanılırdı. Lakin bir gün camaat arasında söz yayıldı ki, Alban kilsələrinin bünövrə daşlarının altında qızıl var. Bunu eşidən hər bir kəs kilsələri sökməyə başladılar. Ərikli kəndi ilə Qurdqajı kəndinin sərhəddində olan Alban kilsəsi belə bir şayə əsasında sökülüb dağıdıldı.

Çoxlu qəbirüstü abidələr-qoç, at heykəlləri ətraf kəndlərin demək olar ki, hamısında vardır. Bir gün söz yayıldı ki, ermənilər qoç, at heykəllərini sındırıb içindən qızıl çıxarıblar. Bu şayədən sonra dərman üçün gəzsən bir dənə də belə bir

qəbirüstü abidə tapmaq mümkün olmazdı, hamısını sındırdılar. Beləliklə, soy kökümüzlə, bağlı qədim abidələrimizin məhv edilməsi (özü də öz əlimizlə) ən dəhşətli və ağrılı yerimizdir. Erməni siyasətinin bu variantı (öz əlimiz, öz yaxamız) bu gün də davam edir. Bu məqamda Paşa bəyin bir sözü yadımıza düşür. Paşa bəy ahıl vaxtında deyirmiş ki, uşaq vaxtı gizlənpaç oynadıqda cavan oğlanla cavan qızın niyə yoxa çıxdığını indi başa düşürəm. Rəhmətlik Paşa bəy demişkən heykəllərin yoxa çıxma səbəbini indi dərk edirəm. Dərk edirəm ki, bu erməni siyasətinin bir variantı imiş.

Belə bir nəticəyə gəlmişəm ki, erməni dili qədim alban dili əsasında formalaşıbdır. Çünki, ermənilər buqələmun toplum olduğu üçün nə varsa assimliyasiya edir, özününküləşdirir. Odur ki, Alban mədəniyyəti bizə erməni dilində gəlib çatmışdır. Erməni kimi tanınan bu xalq Ərməniyyə torpağına yiyələnmiş haylardır. Haylar özgə malını, dilini, yerini, mədəniyyətini və s. tez mənimsəyən, ümumiyyətlə buqələmun olan bir şeydilər. Belə qənaətə gəlmişəm ki, Ərmən Alban tayfası imiş. Bütün Türk tayfaları ilə və eləcə də Albanlarla düşmən mövqedə olan haylar Ərmən tayfasının xristian olmasından istifadə edərək həmin tayfanın adı altında gizlənmişlər. Ona görə belə etmişlər ki, Alban torpaqlarına sahib dursunlar, vətənsiz bir tayfa özlərinə vətən tapsınlar. Bu ideya onların daimi olaraq xain xislətini tənzimləyən atribut kimi səciyyələnir. Ərmən Alban tayfası İrəvan xanlığının ərazisində yerləşirmiş. Gəlmə tayfa olan Haylar Ərmən tayfasını assimliyasiya etmişdir. Ərmən Alban tayfası ilə düşmən mövqedə olan Haylar daimi olaraq Alban tayfalarını təqib etmiş, işgəncələr vermiş, qırğınlar törətmiş, tarixin yaddaşında silinməz izlər qoymuşlar. O qədər Haylar Türk tayfalarını qovmuşlar ki, bu gün də tələsik bir iş gördükdə-«nə olub, hay gəlir?!»-deyirlər. Yəni ən qəddar düşmən və quduz xalq haylardır.

Ərmən sözünün mənası mən igidəm deməkdir. Həmçinin Türk sözüdür. Hay tayfaları Ərmən Alban tayfasını tarixən assimliyasiya etmiş və Ərmən adını özləri üçün millət adı seçmişlər. Onlar «ərmən» adını «erməni» formasında qəbul etmişlər.

Xalq arasında belə bir fikir dolaşır ki, guya «er»-yer, «məni»-mənim (yer mənimdir) deməkdir. Daimi olaraq yer iddiasında olduqları üçün belə ad seçiblər.

İrəvan sözünü də Yerevan etmişlər. Bu sözdə də daimi yer iddiasında olan haylar «yer» sözündən əl çəkməmişlər. Bu gün erməni dediyimiz xəyanət çamurluğu qədim dövrdə hay və yaşadıqları ərazi isə Hayıstan adlanırmış.

Bizim babamız, cəddimiz olan Albanlardan bizi uzaqlaşdırıb özlərini Alban yurdunun varisləri elan ediblər. Xaça, xristianlığa qarşı bizdə kin, küdurət oyadıb özləri isə sonradan xristian və xaçik olublar. Halbuki Albanlar xristianlığı ermənilərdən 270 il əvvəl qəbul etmişlər. Ermənilər xaçı bizə «pıxı», özləri üçün «çiçi» kimi təbliğ ediblər. Lakin bu gün də dədə, babalardan bizə yadigar qalmış adət və ənənələrdə xaça tapınma özünü göstərir. Məsələn, atlarda bəd xassəli şiş olduqda onun üstünə xaç şəkilli dağ çəkirlər ki, bədxassəli şiş çəkilsin, yox olsun. Yəni xaç xeyir qüvvə kimi qəbul edilir. Və yaxud bu gün də çörək bişirilərkən onun üzərinə xaç işarəsi çəkirlər. Ulu soylarımızın çoxunun damğası xaç şəklində olmuşdur. Qədim onomastik adlarımızın xaçla bağlı olması fikrimizi bir daha sübut edir: Məs: Xaçınyalı kəndi, Xaçın çayı, Xaçbulaq yaylağı, Zümürxaç kəndi, Xaçmaz rayonu və s.

Ermənilər Azərbaycan xalqına qarşı yürütdüyü məhvetmə siyasətində ərəblərlə, farslarla bir nöqtədə birləşirlər. Belə ki, İslam dinini qılınc gücünə Azərbaycan xalqına qəbul etdirənlər bu xalqı ilkin mənəviyyatından, soy kökündən, inam və inancından, dinindən ayırıblar. Ermənilər də başqa prizmadan yanaşıb Azərbaycan xalqında xiristiyanlığa qarşı, xaça qarşı ikrah hissi oyadıblar. Bax bu iki məqam eyni nöqtədə birləşir. Hər iki yanaşmanın məqsədi Azərbaycan xalqını öz soy kökündən uzaqlaşdırmaqdır. Ermənilərin isə bu məsələyə belə yanaşmalarının iki məqsədi vardır. Birincisi  Azərbaycan xalqının tarixən düşməni olan erməni bu xalqı məhv etmək, manqurdlaşdırmaq istəyir, ikincisi isə   ondan irəli gəlir ki, özləri Azərbaycan xalqının soy kökü olan Alban tayfasının birinin adı altında gizlənmiş “hay” dır. Ona görə də Azərbaycan xalqını soy kökündən uzaqlaşdırmağa  hər an cəhd göstərir. Məlumbur ki, Albaniya 26 tayfanı əhatə etmişdir. Bu 26 tayfanın

əksəriyyəti Türk tayfaları olmuşdur. Alban tayfaları Albaniya ərazisinin sahibi imiş. Bu ərazilərdə “hay” tayfası yaşamayıbdır. “Hay”ların bu məkanda tarixən əraziləri olmayıb. Lakin bu ərazilərə köçürülən“hay”lar özlərinə əbədi məkan seçmək üçün “Ərmən” Alban tayfasının adı altında gizlənib, Albanyanın Ərmənlər yaşayan Ərməniyyə torpaqlarına sahib durublar. Odur ki, onlar heç vaxt razı olmazlar ki, Azərbaycanlılar öz soy kökünə bələd olsunlar və xristian dininin onlardan əvvəl qəbul etmiş babalarını tanısınlar. Axı tarixdən məlumdur ki, Albanlar xiristiyanlığı “hay”lardan 270 il əvvəl qəbul ediblər. Həmçinin bir də ona görə “hay”lar Ərmən Alban tayfasının adı altında gizlənmişlər ki, həm özlərini Albanların varisləri saysınlar, həm də guya xristiyanlığı əvvəlcədən qəbul etdiklərini sübut etsinlər. Lakin tarixi nə qədər saxtalaşdırsalar da, tarixin daş yaddaşı həqiqəti üzə çıxarır. Bunu ermənilərin öz yazarları da qələmə almışlar. Q.Kapantsyan “Xayasa-kolibel armyan” (Yerevan, 1948) əsərində qeyd etmişdir ki, ermənilər VII əsrədək Kiçik Asiyada Hayasa adlı əyalətdə yaşadıqlarına görə “hay” adlandırılmışlar. Buradan aydın olur ki, bunlar erməni deyil haydırlar. Bü gün də onlar bir-birindən millətini soruşduqda- hayes? – (ermənisən?) –deyirlər.

Müasir elmi araşdırmaya əsasən erməni adlandırdığımız bu riyakarlıq çamurluğu Hind-Aropa mənşəli friqlərin bir qoludur. Ulu əjdadları eradan əvvəl XII əsrdə Balkanlardan Kiçik Asiyaya köçmüş, Hayase əyalətində məskunlaşmış, e.ə. VII əsrdə Urartu dövlətinə qatılmışlar. Urartulular onların bir hissəsini indiki Ermənistan ərazisinə köçürmüşlər. (11, 435)

Buradan aydın olur ki, erməni adlandırılan xalqın adı “hay”dır və yaşadıqları ərazi isə “Hayistan” adlanırmış. Ermənistan ərazisinə gəlmədirlər. Ermənistan qədim Alban tayfası olan Ərmənlərin yaşadıqları Ərməniyyə torpaqlarıdır.

Bizim dövrümüz çoxəsirlik dünya qazanında bişmiş sinxronik bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. anlamları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyum, bunu bizə imkan verir deyək ki, bütün bəşəriyyətin son nöqtədə birləşmə ehtimalı labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Yuxarıda söylənilən fikirlərin

təsdiqini görkəmli filoloq alim, əməkdar elm xadimi, mərhum professor Mirəli Seyidovun “Azərbaycan xalqının soykökyny düşünərkən” əsərində tapa bilirik. M.Seyidov yazmışdır: “…Azərbaycandilli qəbilələrin, qəbilə birləşmələrinin eradan on dörd yüz il qabaq Azərbaycanda yaşaması haqqında bilgi vardır. Sorakı yüzilliklərdə (IV-III) onlar burada elliklə yaşamış və vaxtaşırı el-el buraya gəlib qohum, qardaş qəbiləbirləşmələrinə qaynayıb-qarışmışlar.” (11)

Burada yaşayan və eradan qabaq axınla gələn türkdillilərin dili azı-azı eranın ilk yüzilliklərindən tutmuş ümümxalq danışıq dili qatına yüksəlirdi. Belə olmasaydı, aşağıda görəcəyimiz kimi, V yüzillikdə “Dəli Domrul boyu” Qafqazda, xüsusilə Ermənistanda, Gürcüstanda yayılmazdı və onun yaxından iştirakı ilə əsərlər yaranmazdı. Musa Qağanqatlı əsərində göstərir ki, hələ eranın V yüzilliyində Qazan xan və onun qardaşı haqqında tarixi əfsanə, ola bilsin elə lap əsl əfsanə varmış. Və tarixçi onu az-çox dəyişikliklə əsərinə salmışdır. Ola bilsin ki, Qazanxan əfsanəsini tarixiləşdirmişdir. Deməli Dəli Domrul əfsanəsi, Qazan xan tarixi əfsanə hələ V yüzillikdə Qafqazda Azərbaycan dilində yayılıbmış. Çoxdan-eradan 14 yüz il qabaq yaşamış və sonradan axın halında gələnlər Qafqazda türk dilinin qatını daha da artırmış və bu da Azərbaycan dilinin yayılma arealını genişləndirmişdir, tarixi şərait, ictimai mühit ətrafdakı dillərə təsir etməyə, qarşılıqlı ilişgilərə əsas yaratmışdır. Belə bir durumdu mədəni, dil bağları daha da genişlənirdi. Eranın ilk yüzilliklərindən böyük axınla xəzərlər, az sonra hunlar və b. qəbiləbirləşmələri, xalqlar Qafqaza gəlirlər. Türk qatı böyüyür, genişlənir, ictimai durumu daha da möhkəmlənir. Belə bir durumun qonşu dillərə, xüsusilə erməni dilinə təsiri özünü açıqca göstərir. Bu dil hadisəsini duyan görkəmli bilici H.Acaryan əlli ildən çox müasir erməni dili (aşğarapar) ilə əski erməni dili (qrapar) arasındakı böyük, ciddi ayrılıq, fərq haqqında düşünmüş və axırda yazmışdır:

“Erməni dili strukturunun (sintaksis nəzərdə tutulur-M.S.) quruluşuna görə öz çevrəsində olan və onu işğal edən dillərin-latıncanın, yunancanın, fransızcanın, ərəbcənin, assoricənin və hətta kürdcənin strukturuna quruluşuna uyğun ola-ola birdən-birə bunlardan uzaqlaşır və türk-tatar dillərinin strukturuna oxşayır? Bu

oxşayış tamam təsadüfidirmi? Erməni dilinin struktur qurluşunun dəyişilməsinin səbəbləri yoxdurmu?”(H.Acaryan, Erməni dilinin tarixi, Yerevan, 1951, səh. 292)

H.Acaryan erməni dilindəki böyük dəyişikliklərdən bəhs edərək yazır ki, hər kəs qraparla aşğaraparı müqayisə edərsə ən kiçik məsələdə belə böyük müxtəlifliyi, fərqi görər. Müəllif fikrini isbat etmək üçün bir çox qrammatik məsələləri misal çəkir. O, feldə, təyində və s. dəyişikləkləri göstğərir. Erməni dilinin qruluşundakı ciddi dəyişikliyə H.Acaryan VII yüzilliyin tarixçisi Hovhonnes Mamikonyanın, XI yüzilliyin şairi Heraqasinin dilində tuş olarakən təəccüblənmişdir.

Bircə, Hovhannes Mamikonyan dilindəki dəyişiklik təbii dil hadisəsidir. Əgər Mamikonyanların köklərinin uyğurlarla qan qohumluğu göz qarşısına gətirilərsə, onda məsələ az-çox aydın olar. Görünür ki, türkdilli Mamikonyanlar erməniləşərkən qraparın qrammatik quruluşunda istər-istəməz dəyişiklik etmişlər”. (11, 436) Buradan bir daha aydın olur ki, ermənilər türk tayfasının adı altında gizlənib dilinin qrammatik strukturunu da türk dilinin təsiri altında formalaşdırıb.

Ermənilər haqqında yuxarıda söylənilən fikirlərin təsdiqi və faktı kimi ayrı-ayrı dövrlərdə dünya alimləri, tarixçiləri, səyyahları, ümumiyyətlə, dünya yazarları tərəfindən sübut və dəlil olaraq qələmə alınmış bir neçə aforizmi diqqətinizə çatdırmağı özümə borc sadım:

1. qədii ermənilər bizim eramızdan əvvəl təqribən I minillikdə Fərat çayının yuxarı vadisində meydana gəliblər. (İ.Diakonov (rus alimi))

2. Bu xalq istər xasiyyətinə, istərsə də coğrafi vəziyyətinə görə lap qədimdən ikiüzlü və riyakardır. Bunlar daim romalılara nifrətdən, parfiyalılara isə həsəddən az qala partlayırlar. (Tatsit)

3. Ermənilər həmişə başqa dinə qulluq edən hökmdarların hakimiyyəti altında olublar. Nəticədə öz fikir, niyyət və duyğuları gizli saxlayan, hiyləgər, məkrli və kələkbaz adamlara çevriliblər. (Aleksandr Düma)

4. Ermənilər acgöz və tamahkar, fitnəkar və araqarışdırandırlar. Heç kəsi bəyənməzlər. Onlar xırda bir işi şişirdib, hay-küy salmaqda istedad sahibidirlər və intiriqanı sevirlər. (Vilson (ingilis siyasi xadimi))

5. Ermənilərin kökünü bir xalq kimi kəsmədiyimə görə gələcək nəsillər mənə ya rəhmət oxuyacaqlar, ya da lənət. (2) (Əmir Teymur)

---

## QARABAĞ BƏYLƏRBƏYLİYİ VƏ ONA TABE OLAN HACISAMLI BƏYLİYİ.

Qarabağ bəylərbəyliyi Səfəvilər dövründə mövcud imiş. Bu o deməkdir ki, Qarabağ bəylərbəyliyi Qarabağ xanlığından əvvəl olubdur. Qarabağ bəylərbəyliyinin sahəsi çox böyük bir ərazini əhatə etmişdir. Qarabağ bəylərbəyliyinin sərhəddi-Qərb tərəfdən keçmiş İrəvan xanlığı ilə, indiki Ermənistanla həmsərhədd imiş. Laçın rayonu Qarabağ bəylərbəyliyinin strateji nöqtəsini təşkil etmişdir. Həmçinin Laçın ərazisi ermənilər üçün keçilməz sədd hesab olunmuşdur. Buna görədir ki, 1988-ci ildə ermənilər Laçını özləri üçün «Qara qapı» adlandırmışdılar.

«Qarabağnamələr»in II cildində mərhum professor N.F.Axundov əsərə yazdığı «Son söz» bölməsində qeyd etmişdir ki, Qarabağ bəylərbəyliyi Qarabağ xanlığının sələfidir. Həmçinin onu da qeyd etmişdir ki, Qarabağ bəylərbəyliyinin bünövrəsini Qızılbaş Qacar tayfasının Ziyəddin oymağından olan Ziyadoğlu sülaləsi qoymuşdur. Həmin bəylərbəylik XVI əsrin I yarısından başlayaraq Qarabağ xanlığı dövrünə qədər davam etmişdir.

Isgəndər bəy Münşi 1554-cü ildəki hadisələrdən söz açarkən Qarabağ bəylərbəyisi Şahverdi Sultan Ziyad oğlunu xüsusi olaraq tərifləmişdi. Buradan məlum olur ki, Qarabağın ilk bəylərbəyi Şahverdi Sultan Ziyad oğlu olmuşdur. Şahverdi Sultan Ziyad oğlu Gəncə şəhərini mərkəz seçərkən bütün Qarabağ vilayətini idarə edirmiş. Sultan Ziyad oğlu Qacar hicri 975-ci ildə (1567-1568) vəfat etmişdir. Onun yerinə Ibrahim Sultan Qarabağ bəylərbəyisi təyin olunubdu. Ona xan titulu verildi. Az sonra İbrahim Sultan Şahzadənin tərbiyəçisi təyin edildi və bu münasibətlə Yusif Xəlifə ibn Şahverdi Sultan Ziyad oğlu öz qardaşı əvəzinə Qarabağ bəylərbəyisi göndərildi. İsgəndər bəy Münşi yazır ki, Şah Təhmasib ölərkən hələ Yusif Qarabağa göndərilməmişdi, sarayda idi. Ona görə də II Şah İsmayılın əmrinə görə Yusif Xəlifədən bəylərbəylik fərmanı alındı, onun əvəzinə əmisi oğlu Peykar Sultan Qacar həmin vəzifəyə göndərildi. Özünün gələcək hakimiyyətindən qorxan Peykar Sultan Qacar Yusif Xəlifəni öz evində öldürdü. II Şah Ismayıl Peykar Sultanı

da Qarabağ bəylərbəyliyindən qovdu və onun yerinə İmamqulu xanı bəylərbəyi təyin etdi. 1578-ci ildə İmamqulu xan Qacar Qarabağ bəylərbəyisi oldu.

1586-cı ildə Osmanlı türkləri Azərbaycan ərazisinə daxil olaraq şiddətli müharibəyə başladılar. 1587-ci ildə İmamqulu xan Qacar öldü. Şahverdi xan Ziyad oğlunun nəvəsi Məhəmməd xan Qarabağ bəylərbəyisi təyin olundu. 1588-1589-cu illərdə Qarabağ türklərin hakimiyyəti altında idi. Qarabağ bəylərbəyisi Davud paşa idi. Davud paşadan sonra hakimiyyətə yenidən Məhəmmədqulu Ziyad oğlu Qacar Qarabağ bəylərbəyisi təyin olundu.

1636-cı ildə Qarabağ bəylərbəyisi Məhəmmədqulu xan Ziyad oğlu Qacar Irəvan altında Osmanlı ordusu ilə vuruşdu. O, vilayətin qoşun hissəsi ilə bərabər Irəvan qalasını mühasirəyə aldı və türkləri geri çəkilməyə məcbur etdi.

1664-cü ildə Məmmədqulu xan Ziyad oğlunun həmin vəzifədə Murtuzaqulu xan əvəz etdi. Onun ölümündən sonra isə yaxın qohumu Uğurlu xan Qarabağ bəylərbəyisi təyin edildi.

Nadir şahın hakimiyyəti dövründə və XVIII əsrin ortalarında Gəncə bəylərbəyliyi, Gəncə xanlığının başında dayananlar Ziyad oğlu nəslindən idi. Gəncəli Cavad xan da Ziyad oğlu Uğurlu nəslinə mənsubdur. (9, II cild, 419, 423)

## HACISAMLI BƏYLİYİNİN TƏMƏLİ.

Hacısamlı bəyliyinin təməl daşını Alı oğlu Qara Murtuza qoymuşdur. O bəyliyi Qarabağ xanlığının bünövrəsini qoyan Pənahəli xandan almışdır. Pənahəli xanın Şəki xanı Çələbi xanla döyüşündə Qara Murtuza Yevlağa qədər döyüş yolu keçmiş və Çələbi xanı məğlub edənlərin başçısı olmuşdur. Qələbə bayrağını Pənahəli xana təqdim etdikdə Pənahəli xan ona bəylik rütbəsi vermiş və Hacısamlı ərazisinin bəyi təyin etmişdir. Qara Murtuzanın oğlu Alı bəy olubdur. Alı bəyin erməni qulları məskunlaşdığı kənd Alıqulu kəndi adlanırdı. Bu bəyliyin tarixi təqribən 1749-1830-cu illərə təsadüf edir.

1847-ci ildə Mirzə Camal Cavanşir (1773-1853) M.Vorontsovun tapşırığı ilə «Qarabağnamə» əsərini yazır. Həmin əsərdə Ibrahim xandan geniş məlumat verilir və

orada bəyliklər haqqında belə yazılmışdır: «.....Cavanşir, Otuziki, Kəbirli, Dəmirçi, Həsənli, Bərgüşad, Qaraçorlu, Hacı Samlı, Kolanı və Qapan ellərinin bəyləri ilə Dizaq, Vərəndə, Çiləbörd, Talış və Xaçın mahallarının məlikləri də bir para vilayət xanları kimi dövlət. Əzəmət, cəlal və bünövrə sahibi idilər. Özü(İbrahim xan-Ə.Ə.) tərbiyə edib, rəşadət, çalışqanlıq və səmimiyyətlərinə görə dövlət və rəiyyət sahibi etdiyi başqa bəylər də məşhurdurlar». (10, I cild, 146)

Burada maraqlı cəhət odur ki. Hacısamlı elinin adı çəkilir və axırıncı cümlədə o dövrdə yeni bəyliyin verilməsi təsdiq olunur.

Bəylik həyatda qazanılan titul, rütbə, addır. Çoxları elə başa düşürlər ki, bəylik anadangəlmə, nəslən olur və uzun illər davam edir. Əsla belə deyildir. Nəslin irsi xüsusiyyətləri davam etsə də rütbə davam etmir. Bəyin oğlu bəy olmaya da bilər. Bəyin oğlu həkim, müəllim, hətta maldar da ola bilər. Demək bəylik titulunu müəyyən zaman kəsiyində qazanırlar. Odur ki, Hacısamlı zonasında ilk bəylik titulunu Büloylük (Biləvlik) bəyləri qazanıblar. Sonra isə bəylik titulunu Voronsovdan Paşa bəy alıbdır. Hacısamlı bəyliyinin inkişafı və şöhrətlənməsi Paşa bəy və Soltan bəyin dövründə olmuşdur. Bu bəyliyin ərazisi Laçın rayonunun şimalından Qırxqız dağının aşırımına qədər, Kəlbəcər rayonunun sərhəddi boyunca böyük bir ərazini əhatə edir. Aranı və yaylağı olmaqla maldarlıq üçün əlverişli bir məkandır. Hacısamlı zonasında «Kitabi Dədəm Qorqud»la səsləşən «Qorçu», «Ağalının yalı» («Ağayal»), «Ağ qaya», «Piçənis» («Bikə Yunis»), Alpout (Alpoğuz) kəndi, Əyrək kəndi, Qazan gölü, Qazan bulağı, Qırxqız dağı və s. tarixi adlar və tarixi abidələr bu yerlərin tarixinin daha qədim dövrlərə gedib çıxdığını bir daha sübut edir.

Laçın rayonu yaşayış məskəni kimi qədim əsrlərdən çoxəsrlik minilliklərdən soraq verir. Hətta bu ərazidə xristianlıqdan əvvəllərə də aid abidələr bu gün də \qalmaqdadır. Qalalar, qəsrlər, qəbirüstü abidələr, saxsı bişirmə məkanları, kurqanlar hələ də çoxlu sirlərin açarıdır.

Faiq İsmayılovun «Tarixin faciəsi Laçın» adlı nəfis şəkildə tərtib olunmuş kitabı tarixi sənəd kimi tarixin özünü təsdiqləyir və tarixin yaddaşını vərəqləməklə

dünya xalqlarına bəyan edir ki, təcavüzkar ermənilər minlərlə mənəviyyat dünyamızı, 20% ərazimizi zəbt etmişlər.

Mənim doğulub boya-başa çatdığım Ərikli kəndi ərazisində üç qədim tarixi abidə və çoxlu qəbirüstü abidələr, kitabələr vardır. Qurtqajı kəndi ilə Ərikli kəndinin sərhəddində böyük bir Alban abidəsi vardır. O biri abidə isə Qarasaqal kəndində idi. Üçüncü abidə isə Kiş dağının sinəsində yerləşirdi və ona «Vəng» deyirdilər. Babam söyləyirdi ki, eşitdiyimə görə «Vəng»də zəyərəkdən yağ istehsal edirmişlər. Laçın rayonunda «Zəyli dərə» adlanan yer də var idi.

Burada maraq doğuran adlardan biri də Kiş dağıdır. Şəki ərazisində Kiş kəndi, Kiş çayı vardır. Bu adın anlamı qədim minilliklərdən soraq verir. Belə ki, bu gündə dilimizdə «kiş-kiş» deyə işlətdiyimiz söz hər hansı şər qüvvəni qovlamaq məqsədilə işlədilir. Belə ehtimal olunur ki, bu dağ (Kiş dağı) şər qüvvələri qovmaq üçün seçilmiş məkandır və orada kilsə də tikiblər. Hətta xalq arasında Lola Bağır haqqında söylənilən rəvayət fikrimizi bir daha təsdiqləyir ki, bu da şər qüvvələri, ümumiyyətlə, dərdi-səri qovmaq üçün seçilmiş bir yerdir. Belə nəql edirlər ki, Bağır adlı bir kişinin yeganə varisi olan oğlu ölür. Bağır kişi öz dərdini ovundurmaq və qəmini dağıtmaq üçün Kiş dağına çıxarmış. Kiş dağının zirvəsindən Bağır kişi lola (bayatı, ağı-Ə.Ə.) çağırarmış. Bağırın o qədər uca səsi varmış ki, ətraf kəndlərin adamları onun səsini uzaq məsafədən eşidərmişlər. Odur ki, xalq arasında bu kişiyə Lola Bağır deyərmişlər. Onun yaşadığı kənd bu gün də Lolabağırlı adlanır.

Kiş (xalq arasında bu dağa Keş dağı da deyirdilər) adı tarixin əski çağlarında Qədim Ikiçayarası Şumer mədəniyyəti döiründə formalaşmışdır: “Şumerlər Ikiçayarasının sakinləri idi. Onlar burada e.ə IV minillikdə məskunlaşmışdılar. Son vaxtlar Şumer dilində bir çox türk mənşəli sözlərin olduğu aşkarlanıb. Onların mənşəyi və dini haqda çoxlu fərziyyələr mövcuddur. Lakin məlumdur ki, Şumerlər əvvəlcə ikiçayarasının cənubuna gəlmiş, Eredi şəhərində məskunlaşmış, tədricən bu əraziyə yayılmış və yerli əhali ilə qaynayıb-qarışmışdır. Şumer şəhər dövlətləri e.ə. III minilliyin birinci yarısında meydana gəlmişdir. Şumerdə mövcud olmuş dövlətlər sülalələrin adı ilə tanınırdı. Bunlardan birincisi Kiş sülalə dövlətidir. Bu sülalənin

sonuncu hökmdarı Etana haqqında çoxlu əfsanələr mövcuddur. Kişdən sonra Uruq şəhər dövlətinin yüksəlişi başlanmışdır”. (3, 5)

Burada diqqəti cəlb edən Kiş sülaləsidir. Bü sülalənin adı Laçın rayonunda Kiş dağının, Şəkidə Kiş kəndinin və Kiş çayının adlarında özünü qoruyub saxlamış və 6 min illik tarixi yaddaşı təsdiq edən sənəd kimi tarixin möhür eksponatına çevrilmişdir. Odur ki, biz Laçın ərazisində əcdadlarımızın 6 min illik bir tarixə malik olmuş e.ə. IV minillikdə bu ərazilərin sahibi olmasının şahidi oluruq.

## HACI SAM VƏ HACISAMLI

Sam adı bizə daha qədimdən bəlli olan bir addır. Nuh peyğəmbərin oğlunun birinin adı Samdır. Ulu babamızın Hacı Sam olması bizim üçün fəxrdir. Belə nəql edirlər ki, keçmiş zamanlarda Sam, Şəvə və Kavan adlı üç qardaş indiki Laçın rayonunun Hacısamlı, Şəlvə və Piçənis zonalarında məskunlaşıblar. Bu üç qardaş Qaraqasımlı tayfasına mənsub imişlər. Deyilənə görə Qaraqasımlı tayfası Türkmənistanın Təkə-Türkmən mahalından Irana gəlmiş, oradan isə Qarabağa gəlmiş və Laçında məskunlaşmışdır. Demək bu tayfa təkə-Türkmandan gəlibdir. Bu tayfa «Təkəli» və yaxud «Turkmən» tayfaları adlanırlar. «Təkəlilər - qızılbaş tayfalarından biri – Təkə - türkman tayfasının bir qolu olan təkəlilər Cənubi Azərbaycanda və Kiçik Asiyada köçəri həyat sürürdülər. Səfəvilər dövlətinin siyasi həyatında mühüm rol oynayan təkəlilərin bir hissəsi sonralar mərkəzi hakimiyyətə qarşı çıxdıqlarına görə 1596-cı ildə 1 Şah Abbas tərəfindən məhv edilmiş, qalanları Azərbaycanın müxtəlif yerlərinə yayılmışdır». (1, 244)

«Türkmanlar (türkmənlər) azərbaycanlıların etnogenezində iştirak etmiş türkdilli tayfadır. Səlcuqların tərkibində İrana, Azərbaycana və Kiçik Asiyaya gəlmişlər. Azərbaycan və İranın siyasi həyatında mühüm rol oynamış türkmanlar ağqoyunlulardan ayrılaraq qızılbaş tayfa birliyinin tərkibinə daxil olmuş və Səfəvilər dövlətinin yaranmasında iştirak etmişlər». (1, 402)

Göründüyü kimi hər iki məlumat biri-birini təsdiqləyir və tamamlayır.

Belə nəql edirlər ki, Hacı sam, Şəvə və Kavan müəyyən bir hadisə ilə bağlı olaraq uşaqlarını Cənubi Azərbaycanda qoyub, özləri Qarabağa gəlib Laçın rayonunda məskunlaşıblar. Sonradan onların uşaqları böyüyüb ailə qururlar, varlı bir duruma mənsub olurlar. Odur ki, öyrənirlər ataları Arazın o tayındadır. Ailə və uşaqlarını da götürüb (Qasım və Bayram) Beyləqan ərazisinə gəlib çıxırlar. Beyləqanda Şahsevən quldur dəstələri Qasımın və Bayramın köçünə hücum edirlər. Talan-qarət olunan Qasım və Bayram qundaqda olan iki oğlan uşağını da itirirlər. Nəhayət, soraqlaya-soraqlaya Qasım və Bayram gedib atalarını tapırlar. Qasım atası Hacı Samın, Bayram isə atası Hacı Şəvənin mülklərinə sahib olurlar. Şəvə qara mənasında bu gün də işlənilir. Şəvənin oğlu Bayramın rəngi qara olduğuna görə Qara Bayram deyirmişlər. Heç də təsadüfi deyildir ki, bütövlükdə nəsil Qara Qasımlı qəbiləsi adlanır. Lakin burada qara rəng mənasında deyil, güclü, varlı mənalarında işlənir.

Hacı Sam məskunlaşdığı zona Hacısamlı, Şəvə məskunlaşdığı zona Şəvəli(Şəlvə), Kavan məskunlaşdığı ərazi Kavanlı adlanıbdı. Lakin Hacı sam daha varlı və bacarıqlı olduğu üçün bütövlükdə bu ərazilərə Hacısamlı zonası deyiblər.

## QASIM HACI SAM OĞLU VƏ ONUN ƏMISI OĞLU QARA BAYRAM ŞƏVƏ OĞLU HAQQINDA.

Qasım Şamkənd(Samkənd-Ə.Ə.), Ələkçi, Çorman, Ərikli və Qurdqajı ərazilərində məskunlaşıb qohum əqrəbası ilə yaşayırmış. Əmisi oğlu Qara Bayram isə Şəlvə dərəsində məskunlaşıbmış. Vaxtilə Beyləqan ərazisində Şahsevənli quldur dəstəsi ilə qarşılaşmada itirdikləri uşaqlardan biri(Əhməd) Cənubi Azərbaycanda böyüyür və evlənir. Əhməd adlı bu şəxs öyrənir ki, atası Arazın o tayında Qavrabağ ərazisində yaşayır. Ailəsini, nökər-naibini götürüb Qarabağa köç edir. Atasını soraqlaya-soraqlaya gəlib Laçın rayonunun Pircahan kəndindən yuxarı Hacısamlı kəndindən aşağı bir təpədə köçünü əyləyir. Həyat yoldaşı hamilə imiş. Atdan düşmək istədikdə yəhərin qaşı qadının qarnına batır və qadın oradaca ölür. Qadını orada dəfn edirlər və oranı «Tək qəbir» adlandırırlar. Bu gün də həmin yerə Tək qəbir deyilir.

Nəhayət, Əhməd bilmir ki, Qasımın oğludur, yoxsa Qara Bayramın. Əhməd hər iki əmioğluya xəbər göndərir və belə qərara gəlir ki, kim birinci onun görüşünə gəlsə onunla gedəcək. Birinci özünü yetirən Qasım olur. Əhməd deyir: -Getməyə Qasım kişi ilə gedəcəyəm, ona görə ki, uzun ayrılıqdan sonra mənim görüşümə ilk özünü yetirən Qasım kişi oldu. Bu gündən mənim atam odur. Amma mən doğrusunu bilmək istərdim ki, həqiqi atam kimdir?

Bu zaman Qara Bayramın arvadı deyir ki, mənim uşağımın qılçında yanıq var idi. Əhməd həmin yanığın öz qılçında olduğunu aşkarlayır və bilir ki, Qara Bayramın oğludur. Lakin sözünə əməl edərək Qasımla gedir. Qasımın qızı ilə evlənir və böyük bir nəsil təşkil edir. Həmin nəsil Əhməd oğlu adlanır. Həmçinin bu nəslə «ayı boğan Əhməd oğlu» deyirlər. Bu onunla əlaqədardır ki, Əhməd çox gövdəli, pəhləvan cüssəli bir kişi olubdur.

Bir dəfə Qırxqız dağından gecə atlı gəlirmiş. Qaranlıqda arxadan bir vəhşi onun üstünə atılır. Vəhşinin başını qoltuğunun altında bir dəfə var gücü ilə sıxıb buraxır və evə gəlir. Arvada deyir ki, başıma belə bir hadisə gəldi və qabırqalarım ağrıyır. Baxıb görürlər ki, kişinin bir yan qabırğaları sınıbdı. Səhərisi gün həmin hadisə olan yerdən bir ayı cəmdəyi tapırlar. Ona görə də Əhmədə «ayı boğan Əhməd» deyirlər. Sonralar bu deyim onun nəslinə aid edilib «ayı boğan Əhməd oğlu» demişlər.

Əhmədin Cənubi Azərbaycandan gətirdiyi nökərinin adı Nəzər imiş. Söz-söhbət yaranır ki, Əhməd Nəzərin arvadı ilə gəzir. Əhməd ağzıgöyçəklərin belə söz-söhbətinə biganə yanaşır və Nəzərin yanından keçəndə salam verir, görür ki, Nəzər onun salamını almadı. Fikirləşir ki, ola bilsin eşitməyib. Yenə oradan qayıdıb lap hündürdən salam verir. Nəzər cavab vermir. Əhməd əmr edir:

-Nəzər, tez bura gəl!

Nəzər nökər olduğu üçün əmrə müntəzir dayanır və irəli gəlir. Əhməd deyir ki, bəri əyil qulağına söz deyəcəyəm. Nəzər əyilir. Əhməd belindən xəncərini çıxarıb Nəzərin qulağını kəsir və deyir:

-Bu qulağında qalsın ki, ağa nökərinə xəyanət edib, pis gözlə baxmaz.

O vaxtdan nəzərə «kərə Nəzər» deyiblər. Bu gün də «Kərə Nəzərli» tayfası vardır.

**Dərələyəzli Heydər**

Dərələyəz mahalından Sisyan rayonunun Ərikli kəndinə gəlib, orada məskunlaşan Heydərgilin ailəsinin taleyinə nələr yazıldığını heç kəs bilmirdi .Sisyan rayonunun Ərikli kəndi Ərikli dağlarının ətəyində , Ərikli çayının sahilində yerləşirdi.Bu kəndin əhalisi azərbaycanlılardan ibarət idi. Odur ki,erməni cəlladları bu kəndi talan-qarət etmiş ,əhali pərən-pərən olmuşdur. Əriklilər Azərbaycanın müxtəlif ərazilərində məskunlaşmışlar və məskunlaşdığı əraziləri "Ərikli"adlandırmışlar.Bu söz "ər"tayfasının adı ilə bağlıdır,yəni ərlər,ərənlər məskunlaşdığı yer anlamını verir.Laçın rayonunun Ərikli kəndi də belə yaranmışdır. Belə ki, Sisyan rayonunun Ərikli kəndindən didərgin düşmüş Heydərgilin ailəsi Araxış adlanan yerdə məskən salmışdır.O,zaman bu ərazilər Qara Qasımlı tayfasından olan Qasım kişinin himayəsində imiş. Qasım kişi adam göndərib, tapşırıq verir ki, gedin ,baxın,onların atları,öküzləri arıq,itləri yallıdırsa,biz onları qonşuluğa götürə bilərik,əgər belə deyilsə,qovun getsinlər.Gedib görürlər ki, Qasım kişi dediyi kimidir.( Bu o deməkdir ki,zəhmətkeş ərləri varsa ,atları və öküzləri arıq olacaq,əgər evdə evdar qadınları varsa itləri yallı olacaq.) Odur ki, onları qəbul edirlər.Beləliklə Heydərgilin ailəsi orada məskunlaşırlar. Heydər Qasım kişinin qızı ilə evlənir.Alı və Bağır adlı oğlanları olur.

Dərələyəzli Heydər çox sərt və cəsur adam olmuşdur.Odur ki, Paşa bəy belə deyərmiş ;

-Atınızı elə yerdən sürün ki, Heydərlinin suyuna dəyməsin,atınız bədnal olar .Yəni atınız tündləşər , nallanmağa qoymaz .

**NƏBİ OĞLU XANMURAD HAQQINDA.**

Hacı Sam oğlu Qasımın (Qara Qasımlı qəbiləsindən) üç oğlu olur: 1. Molla Həsən, 2. İbrahim və 3. Nəbi. Nəbinin isə beş oğlu olur. 1. Xanmurad, 2. Şahmurad, 3. Sultanmurad, 4. Gülmurad və 5. Almurad.

Xanmurad camaat arasında sadəcə olaraq Murad adı ilə çağrılarmış. Murad zirək, çalışqan və əməksevər bir gənc imiş. Xırda alverlə məşğul olar, at-qatır saxlarmış. Yaxşı atı və qatırı tanımaqda Murad mahir imiş. Ona görə də camaat arasında qatırçı Murad kimi tanınırmış.

Nəbi oğlu Xanmurad Hətəmlər kəndindən Şahverdinin bacısı Ağapəri ilə evlənir. Bir oğlan uşağı anadan olur, adını Paşa qoyurlar.

Xanmurad xırda alverçi olduğu üçün kəndləri gəzir, hamı ilə əlaqə saxlayır, ünsiyyətdə olur. Bir gün Xanmuradın həyat yoldaşı Ağapəri öyrənir ki, Xanmurad Əsəd Sultanlar kəndindən Əsəd Sultanın dul qalmış bacısı Bəyim xanımla evlənmək istəyir. Bu zaman Ağapəri bir məktub yazıb Bəyim xanıma göndərir və etirazını bildirir ki, mən sonsuz deyiləm ki, mənim üstümə günü gəlirsən. Odur ki, belə yazır:

Gülü gülüstan üstünə
Gün düşüb bostan üstünə
Gedin deyin o tülküyə
Gəlməsin aslan üstünə.

Məktub Bəyim xanıma çatır. O məktubu oxuyur və qürurunu pozmadan cavab yazır:

Gedin deyin ağlamasın,
Başına qara bağlamasın
Tülkü deyib çağlamasın
Dağ gəlir aslan üstünə.

Və yaxud belə bir variant da söyləyirlər:

Çaşırı vurdum şəliyə
Getdim çıxdım Dadməliyə
Gedin deyin Ağpəriyə (And olsun ağam Əliyə)

Dağ gəlir aslan üstünə.

Nəhayət, Xanmurad Əsəd Sultanın bacısı Bəyim xanımla evlənir. Bu izdivacdan sonra Xanmurad oğlu Paşaya bəy rütbəsi almaq üçün Soltanov familiyasını qəbul edir və Qafqaz canişini M.Voronsovdan bəylik rütbəsini alır. Paşa bəy Hacısamlı zonasının bəyi təyin edilir.

Xalq arasında sadəcə qatırçı Murad kimi tanınan Xanmurad oğluna bəylik rütbəsi alandan sonra onun haqqında belə bir deyim formalaşır:

Hər ağacdan masan olmaz
Hər igiddən Həsən olmaz
Hər qatırçı Murad olmaz
Hər oxuyan Molla Pənah.

Sonralar bu deyim atalar sözü şəklində belə formalaşıbdır: «Hər oxuyan Molla Pənah, hər qatırçı Murad olmaz».

Yəni qatırçı olsa da bəylik aldı. Molla Pənah Vaqif haqqında da elə həmin mənada deyilibdir. Çünki Vaqif molla olsa da mollalıq etməmiş, şair olmuş, vəzirlik rütbəsinə qədər yüksəlmişdir. Xalq bu mənada fikir yürüdür ki, yəni hər qatırçı bəy olmaz, hər molla vəzir olmaz. («Hər oxuyan Molla Pənah, hər qatırçı Murad olmaz»).

## PAŞA BƏY XANMURAD OĞLU SULTANOV.
## 1837-1915

Paşa bəyin atası Xanmurad, anası isə Hətəmlər Şahverdinin bacısı Ağapəridir. Təqribən 1837-1915-ci illərdə yaşamışdır. Laçın rayonunun Qurdqajı kəndində doğulub, orada vəfat etmişdir.

Uşaq vaxtı yoldaşları ilə oynayarkən dizə qədər ayaqlarını palçığa bulayıb deyərmiş ki, mən bəyəm, ayağımda xrom çəkmə var, (palçığa işarə edərək belə deyərmiş) kim sözümdən çıxsa şallaqlayacağam. Paşanın bu uşaqlıq arzusu reallığa çevrilir. Paşa bəylik almaq üçün Qafqaz canişini knyaz M.Vorontsovun evinə getməli olur. Darvaza qapısında M.Vorontsovun uşaqları ilə qarşılaşır və hər birinə bir qızıl

onluq verib deyir ki, gedin atanıza deyin ki, Paşa bəy sizinlə görüşmək istəyir. Uşaqlar M.Vorontsova deyirlər ki, Paşa bəy gəlib səninlə görüşmək istəyir. Nəhayət, söhbət əsnasında M.Vorontsov deyir ki, sizə bəyliyi mənim uşaqların artıq veriblər.

Xalq arasında Paşa bəy kimi şöhrət tapan şəxs sənədlərdə Əlipaşa bəy kimi qeyd olunur. Əlipaşa bəy Xanmurad bəy Sultanovun bəylik alması barədə tarixi sənəd Azərbaycan Dövlət Tarix Arxivində saxlanılır. Həmin sənəddə qeyd edilir ki, Şuşa bəə komissiyasının 21 dekabr 1872-ci il 374 saylı protokoluna əsasən Əlipaşa bəy Xanmurad bəy oğlu Sultanovun bəy nəslinə mənsub olması təsdiq edilir. Şuşa bəə komissiyasının çıxardığı qərar 16 avqust 1877-ci ildə qafqaz canişini tərəfindən təsdiq edilir və Əlipaşa bəy Xanmurad bəy oğlu Sultanovun adı Yelizavetpol quberniyasının Zəngəzur qəzasının bəyləri siyahısına daxil edilir. Əlipaşa bəyə verilmiş sənəddən məlum olur ki, 1872-ci ildə onun 35 yaşı var imiş. Buradan aydın olur ki, o, 1837-ci ildə anadan olmuşdur.(19,4) Həmçinin bu sənədə əsasən məüəyyən olunur ki, Əlipaşa bəyin həyat yoldaşı Bəyim xanım 1844-cü ildə, qızı Aftab xanım 1869-cu ildə, oğlu Sultan bəy isə 1871-ci ildə anadan olmuşdur.

Paşa bəy qoçaq, ağıllı, tədbirli və zirək adam imiş. Atası Xanmuradın varına sahib olan Paşa bəy Hacısamlı kəndində məskən salır. Paşa bəyin birinci arvadı Bəyim xanım olmuşdur. Bəyim xanım Pərioğullar kəndindən Abbasqulu bəyin qızıdır. Bəyim xanımdan Soltan, Isgəndər, Xosrov, Rüstəm, Aftab anadan olmuşlar. Seyid Hacı Mirəzizin qızı Ağaxanımla da evlənir. Ağaxanımdan Bahadur, Srafil, Zülü, Ziba və Məhbub dünyaya gəlirlər

## PAŞA BƏY HAQQINDA XALQ DEYİMLƏRİ.

Paşa bəy həmişə doğruluğun, düzgünlüyün, ədalətin tərəfdarı imiş. Xalq da ona görə Paşa bəyə rəğbət bəsləyirmiş.

Qorçu kəndində Molla Şərif adlı bir kişi yaşayırmış. Molla Şərif vəsiyyət edir ki, bu zonalarda savadlı bir molla yoxdur məni, o, şəriətin bütün qayda-qanunlarına düzgün riayət etməklə, dəfn etsin. Odur ki, məni Paşa bəy ədaləti ilə dəfn etsin. Bu

zaman xəbər yayılır ki, Paşa bəy öldü. Bu xəbəri eşidən Molla Şərif öz-özünə deyir:-«Öl, Molla Şərif, öl. Heyvan kimi öl! Artıq səni dəfn etməyə bir ümid yeri qalmadı».

## MƏRGI XƏSTƏLİYİ.

Paşa bəyin qaynatası Seyid Mir Əziz çox xəsis adam imiş. Bu xüsusiyyət daimi Paşa bəyi narahat edirmiş. Odur ki, belə deyərmiş:-«Bu dünyaya Seyid Mir Əziz baxdı getdi, Paşa bəy daddı getdi, Ağalar yedi getdi». Göründüyü kimi bu kəlamda da Seyid Mir Əzizin xəsisliyinə işarə olunur. Onun həm də seyiddən xoşu gəlməzmiş, belə deyərmiş:-«Bir kəndi dağıtmağa yüz kazak na lazım, bir seyid bəs edər».

Nəhayət, bir qış Seyid Mir Əziz Paşa bəyə deyir ki, yem toplamamışam, mənim yüz keçim var, bunları bir təhər bu qış saxlatdır. Paşa bəy rədd etmək istədikdə Aşıq Abbas razılıq alır və Seyid Mir Əzizin keçilərini gətirib qış yaza qədər kəsib yeyirlər.

Bir gün keçilərini yoxlamağa gələn Seyid Mir Əzizə deyirlər ki, bəs keçinin içinə bir xəstəlik düşüb, tutan kimi öldürür. Günorta Seyid Mir Əziz namaz qılan zaman keçinin birinin qulağını Aşıq Abbas uşaqlara dişlətdirir. Keçi hay-həşir qopararaq bəyirir. Namaz üstə söz danışmaq qadağan olduğu üçün bir söz deyə bilməyən Mirəziz əli ilə işarə edir ki, başını kəsin. Keçinin başını kəsirlər.

Aşıq Abbas öyrədir ki, əti keçinin ödünə bulayıb bişirin. Belə də edirlər. Mirəziz bir tikə ağzına qoyub tez çıxarır və rədd eləyin bizi qırar deyir. Seyid Mir Əzizə söyləyirlər ki, bax beləcə keçiləri xəstəlik tutdu, hamısını basdırdıq. Seyid Mirəziz soruşur ki, bu xəstəliyin adı nədir? Hazırcavablığı ilə həmişə diqqəti cəlb edən Aşıq Abbas deyir ki, «mərgi» xəstəliyi. Heç bir sözü olmayan Mir Əziz kor-peşman əliboş evlərinə dönür. «Mərgi» xəstəliyi adı altında kişinin yüz keçisini yeyirlər. Atalar gözəl demişdir: "Mal yeməzin malını yeyərlər".

## XURMA, YOXSA QIRMA.

Paşa bəyin mirzəsi kar Bəhmən olubdu. Paşa bəy deyib ki, Bəhmən yaz Irandan dostlar bizə xurma göndərsinlər. Bəhmən ağır eşitdiyinə görə xurma əvəzinə qırma eşidib. Məktubda da yazıb ki, qırma göndərsinlər. Bir müddətdən sonra Paşa bəyin dostu İrandan bir neçə at yükü qırma göndərir. Paşa bəy işin nə yerdə olduğunu anlayır. Odur ki, Bəhməni çağırıb deyir ki, Bəhmən, xurma, yoxsa qırma?! Bəhmən, yazdın qırma gəldi, indi də yaz top-tüfəng göndərsinlər.

## SƏNİN DƏRDİNƏ DƏRMAN YOXDUR.

Bir gün Məşədi Şükür bərk xəstələnir. Hüsen adlı(Hüseyn) bir nəfər kəndlisini göndərir ki, get Paşa bəydən mənə dərman al gətir. De ki, Məşədi Şükür sətəlcəm olub (soyuqlayıb) ona dərman lazımdır. Hüsen gedib Paşa bəyin evinin 100 metrliyində dayanır və çağırıb deyir ki, Paşa bəyə deyin mənə tərəf gəlsin, sözüm var. Nökərlər Paşa bəyə deyirlər ki, icazə ver o kimdirsə döyüb qovaq. Paşa bəy deyir ki. o kimdirsə onun qabına qoyulan o qədərdir, işiniz olmasın. Durub çəliyi əlinə alır və Hüsenə yaxınlaşıb. Nə üçün gəldiyini soruşur. Hüsen deyir ki, Məşədi Şükür üçün dərmana gəlmişəm. Paşa bəy deyir: -Məşədi Şükürə dərman olacaq, amma sənin dərdinə dərman yoxdur. Bu sözlər sonralar xalq arasında («Sənin dərdinə dərman yoxdur») məsəl kimi işlənmişdir.

## MƏNƏ CANININ QƏDRİNİ BİLƏN İNSAN LAZIMDIR.

Bir gün Paşa bəy çobanları sınağa çəkir ki, görüm bunlar insan kimi öz canlarının qədrini bilirlər, yoxsa yox?!

Axşam mal-qoyun örüşdən qayıtdıqdan sonra çobanlar çörəklərini yeyib öz adətləri üzrə yatırmışlar. Paşa bəy əmr edir ki, çobanların hamısınının çarıqlarını qumla doldurun. Əmr yerinə yetirilir. Səhər tezdən hamıdan qabaq yuxudan duran Paşa bəy çobanların çarıqlarını geymələrini müşahidə edir və görür ki, bir neçəsi çarıqlarını təmizləyib geydi, bir neçəsi isə təmizləməmiş geydi və getdi. Axşam çobanlar qayıtdıqda çarıqlarını təmizləməyib geyinənləri işdən qovur və deyir ki. öz

canının qədrini bilməyən, mənim malımın qədrini bilməz. Mənə öz canının qədrini bilən insan lazımdır.

## SULTAN BƏY PAŞA BƏY OĞLU SULTANOV

Sultan bəy 1871-ci ildə Zəngəzur qəzasının Hacısamlı nahiyəsinin Qasımuşağı obasında anadan olmuşdur.


Султан бәјин һəјат јолдашы Дилруба ханым.


Султан бәјин гызы Бәјим ханым

Soltan bəy Paşa bəyin oğlanlarının böyüyü imiş, Pəroul bəylərindən olan Teymur bəy Həsənbəyovun qızı Dilruba xanımla evlənibmiş. Oğlanları Çingiz, Ənbər, Mustafa Kamal, Yusif Kamaldır, qızı isə Bəyim xanım olmuşdur.

Atası Paşa bəydən sonra əsas bəylik fəaliyyətini yerinə yetirən və bəyliyi idarə edən Soltan bəy olmuşdur. Sultan bəyin mirzəsi və ən yaxın adamı Lələ olmuşdur. Sultan bəyin mirzəsi, xəzinədarı, qoşunu, nökərləri də olmuşdur. Sultan bəyi şöhrətləndirən cəhət onun cəsarəti və qorxmazlığıdır. O bu cəsarət və qorxmazlıq sayəsində xaricdə xüsusi hərbi təlim almış Andranik Uzunyanı məğlub

etmişdir. Museyib bəy Sultan bəyin sərkərdəsi olubdur. Rəcəb və əbdül Sultan bəyin nökərləri olubdur. 1920-ci ildən sonra Azərbaycanda Sovet imperiyası fəaliyyətə başladı. Bu vaxtdan etibarən bəylər qaçaq vəziyyətində el içində yaşayırdılar. Onları el saxlayırdı. Belə bir məqamda xalqın içərisində qaçaq vəziyyətində yaşayan Sultan bəyi məhv etmək üçün Mir Cəfər Bağırov belə bir üsuldan istifadə edir. Sultan bəyin sərkərdəsi Museyib bəylə görüşür və Sultan bəyi aradan götürməsə onu öldürməklə hədələyir. Museyib bəy söz verir ki, Sultan bəyi öldlürəcəkdir. Museyib bəy qardaşı Calalla bu işi yerinə yetirməyi qərara alırlar. Sultan bəy və Lələ qarşı-qarşıya durub söhbət etdikləri vaxt Museyib bəy Sultan bəyin arxa tərəfindən beşaçılanla nişan alır və tətiyi çəkmə anında təsadüfən Sultan bəy aşağı əyilir. Bu anda güllə açılır, Sultan bəyin çiynini yaralayır və Ləlǝni öldürür. Sultan bəyi gizli yerlərdə müalicə edirlər. Axırıncı dəfə bir kahada müalicə edən zaman deyir ki, mənim yerimi dəyişin, kahanının tavanı uça bilər. Onun yerini dəyişməklə kahanın tavanının uçması bir olur. O deyir ki, artıq mənə ölüm yoxdur. Sonra Sultan bəy öyrənir ki, ona güllə atan Museyib bəydir. Sultan bəy Arazı keçib Irana getmək məqamında Museyib bəyi Alyanlı kəndinə çağırtdırır və orada onu işgəncə ilə öldürtdürür. Sonra İrana, oradan isə Türkiyəyə gedir. Qars viləyətinin Köçqoy kəndində yaşamış, 1955-ci ildə vəfat etmişdir.

Museyib bəyin işgəncə ilə öldürüldüyünü eşidən Mir Cəfər Bağırov öyrənir ki, Museyib bəyi aldadıb Alyanlıya gətirən Sultan bəyin Alyanlı dostlarından olub. Odur ki, Alyanlı kəndinin əhalisini uşaqdan tutmuş böyüyə qədər hamı bir nəfər kimi qırdırır, kəndi yerlə yeksan edir.

1970-ci ilə kimi Mir Cəfər Bağırovun Museyib bəyə bağışladığı (Sultan bəyi yaraladığı üçün) xəncər Museyib bəyin qızı Zeynəbdə idi. Zeynəb Hacısamlı kəndində yaşayırdı. Həyat yoldaşının adı isə Ağəli idi.

Sultan bəy Sovet hakimiyyətindən qaçaq vəziyyətində «Gorgahatın» meşəsində bir yarğanda gizlənərmiş. Bir dəfə onu tanımayan və sonradan tanıyıb üzr istəyən həmkəndlisinə belə deyir:

Mən aşiqəm yarqana

Yar sözünü yar qana.
Aləmə sığmaz başım
Sığınıbdır yarğana.

Sultan bəy vətəndən, doğma yurddan ayrılarkən Qırxqız yaylağına qalxır, dağları seyr edir və bayatı çağırır:

Mən aşiq qəm qalağı
Dağların qəm qalağı,
Dağlardan uca könlüm
Olubdur qəm qalağı.

Mən aşiq dolan gözüm
Dol gözüm, dolan gözüm
Gedərsən qayıtmazsan
Vətəni dolan gözüm.

Sultan bəy cəsarətdə bəlkə analar elə bir oğul bir daha dünyaya gətirməmişlər. Söyləyirlər ki, Əbdülxalıqın kürəyinə Sultan bəyin vurduğu xəncərin yarasının yeri bir ovuc darı tuturmuş. Sultan bəy öz cəsarəti ilə Andraniki tarixin yaddaşından silmişdir. Xalq arasında belə bir kəlam bu gün də işlənir: -«Paşa bəy ədaləti ilə, Sultan bəy cəsarəti ilə yaşayır.

Sultan bəyin cəsurluğunu yaşadan igidlərimiz bu gün də az deyildir. Odur ki, Qarabağ savaşında igidlik göstərən və mərdliklə şəhid olan 309 nəfər Laçınlı cəsurlar Azərbaycan xalqının yaddaşında əbədi yaşayacaq, həmçinin vətənimizin igidlik salnaməsi tarixinə əbədi həkk olunacaqdır. Bu şəhidlərdən Oqtay Güləliyev, israfil Şahverdiyev, Kamil Nəsibov, Qoxmaz Eyvazov, Ələsgər Novruzoı, Fazil Mehdiyev «Azərbayjanın Milli Qəhrəmanı» fəxri adına layiq görülüb. Onların ruhları o zaman rahat olub bizi bağışlayacaqdır ki, biz düşmən tapdağı altında olan Qarabağımızı azad edək. İnşallah…..

**AŞIQ ABBAS.**

Duzlu, məzəli söhbətləri ilə, sazı, sözü ilə xalqın qəlbində özünə məhəbbət qazanan və yaddaşlarda qalan Aşıq Abbas Piçənis kəndindəndir. Paşa bəyin və Sultan bəyin məsləhətkeşi və məclislərinin başında əyləşən sazı və sözü ilə ürəkləri fəth edən bir sənətkar imiş.

Kəndin tacı Qurdqajıdı
Sözləri tamam ajıdı
Hamı ağıl möhtajıdı
Paşa bəyi qatmaq olmaz.

Aşıq Abbasın Sultan bəyin cəsurluğu və düşmənə qarşı döyüşdə igidliyi haqqında şerləri vardır:

Çağırın igidlər girsin meydana
Gavırın başını batırsın qana
Dağlar arxa dursun böyük Sultana
Düşmənin başını əzəcəyik biz
Ulğumun bədəndən üzəcəyik biz.

Bir gün cavanlar qış vaxtı qonşu kənddən bir cöngə oğurlayıb gətirirlər. Cöngənin belində dağlanmış yer olur və həmçinin cöngə çullu imiş. Cöngə sahibi qarda cöngənin izinə düşüb düz cöngə kəsilən yerə gəlib çıxır. Burada Aşıq Abbas da olur. Cöngə sahibini  Aşıq Abbas guya and içir ki, cöngə burada yoxdur. Amma bütün nişanlarla cöngənin kəsildiyini söyləsə də avam kəndli heç nə anlamır və kafir deyiləm ki, and içdin mən də inandım deyib çıxıb gedir. Aşıq Abbas belə and içmişdir:

And içim, arpa biçim,
Belində dağı cöngənin
Bu sulu, bu örkəni,
Cızıldar yağı cöngənin.

Aşıq Abbas bədahətən şeir dediyi üçün Xurşidbanu Natəvan onu daim dinləyər və məclislərinə dəvət edərmiş. Aşıq Abbas da bədahətən onun şəninə şeirlər

söylərmiş. Bir gün Cıdır düzündə bayram şənliyi keçirilirmiş. Buraya Aşıq Abbasda dəvət olunmuşmuş. Məclisə gec gəlsə də bədahətn Xan qızının şəninə söylədiyi şeir onu vəziyyətdən çıxarır:

Sevgili sultanım, istəkli xanım,
Yadlarla aşinalıq eyləmə.
Dön başına könül sevən aşiqin,
Hər nakəsə ilticalıq eyləmə.

Qoynun içi qızıl gülün çəməni,
Dodaqların ləl, mərcan-Yəməni,
Aşiqinəm hər dəm yada sal məni,
Vəfalı yar bivəfalıq eyləmə.

Nə müddətdir həsrətini çəkirəm,
Gözlərimdən qanlı yaşlar tökürəm,
Vəfalı qulunam, sənə nökərəm,
Padşahım, gəl gədalıq eyləmə.

Hüsnün düşüb Dağıstana, Dərbəndə,
Dodaqların bənzər nabata, qəndə,
Bir busə lütv eylə mən dərdiməndə,
Ağrın alım, nakəsalıq eyləmə.

**XOSROV BƏY PAŞA BƏY OĞLU SULTVANOV.**
**(1879-1956)**

Azərbaycan xalqının vətənpərvər övladı və tarixi şəxsiyyət olan Xosrov bəy Sultanov 1879-cu il may ayının 10-da Laçın rayonunun Qurdqajı kəndində anadan olmuşdur. Əvvəlcə Gəncə gimnaziyasında oxumuş, sonra Odessa şəhərindəki Novorossiysk universitetinin tibb fakültəsinə daxil olmuş, 1903-cü ildə oranı bitirdikdən sonra Tiflisdə bir müddət həkim işləmişdir. 1917-ci ildə Müsavat partiyasına daxil olmuşdur. Zaqafqaziya seyminin üzvü olan Xosrov bəy Sultanov sonra Ittihad partiyasına keçmişdir. O, Fətəli xan Xoyskinin birinci hökümətində (1918-ci ilin may, iyun ayları) hərbi nazir, ikinci hökumətində (1918-ci ilin iyun,dekabr ayları) və üçüncü hökumətində (1918-ci ilin dekabr,.1919-cu ilin mart ayları) Əkinçilik naziri olmuşdur 1919-cu il yanvarın 29-da Cavanşir, Şuşa, Cəbrayıl və Zəngəzur qəzalarına General-qubernator təyin edilmişdir. Xosrov bəy Sultanovun fəaliyyəti nəticəsində erməni əhalisi Azərbaycan dövlətinin hakimiyyətini tanımışdır.

Bolşevik təqibindən yaxa qurtarmaq üçün məcburiyyət qarşısında doğma vətənini tərk etmiş, müxtəlif ölkələrdə mühacirət həyatı yaşamışdır. 1923-cü ildən sonra Xosrov bəy Sultanov Almaniya, Fransa və Türkiyədə yaşamışdır. O, mühacirətdə olduğu müddətdə də öz siyasi mübarizəsini davam etdirmiş bir sıra uğurlar əldə etmişdir. 1926-cı il martın 4-də Parisdən Tehrana gələrək Azərbaycanla əlaqələrin möhkəmləndirilməsi üçün «Ittihad» partiyasının Tehran komitəsinə Aşur bəy Isabəyi, Təbriz komitəsinə isə qardaşı İsgəndər bəyi təyin etmişdir. (7, 70)

İkinci dünya müharibəsi illərində Xosrov bəy Sultanov Türkiyədə yaşayırmış. Almanlara əsir düşmüş azərbaycanlıların Almaniyanın həbs düşərgələrindən xilas etmək üçün böyük xidmətlər göstərmiş, minlərlə azərbaycanlını xilas etmişdir.

Azərbaycan Xalq Cümhuriyyəti elanolunma aktına imza atan 26 nəfərdən biri olan Xosrov bəy Sultanov 1956-cı ildə Türkiyənin Bursa şəhərində vəfat etmişdir.

## İsgəndər bəy Paşa bəy oğlu Sultanov

İsgəndər bəy maldarlıqla məşğul olmuşdur. Lakin tarixi sənədlərdə qeyd edilir ki, 1926-cı il martın 4-də Xosrov bəy Sultanov Parisdən Tehrana gələrək Azərbayjanla əlaqələrin möhkəmlənməsi üçün tədbirlər gördü. O, “Iftihad” partiyasının Tehran komitəsinə Aşur bəy Isabəyli, Təbriz komitəsinə isə qardaşı Isgəndər bəyi təyin etmişdir (7, 70)



Buradan aydın olur ki, İsgəndər bəyin siyasi fəaliyyəti də olmuşdur. O, Ərikli kənd sakini, yağlı kəndli adlandırılan Həşim kişinin qızı Samavar xanımla evlənmiş. İki övladı olmuşdur. Kamal bəy və Məhluqə xanım.



„ДВАДЦАТЬ ЛЕТ ПОБЕДЫ В ВЕЛИКОЙ ОТЕЧЕСТВЕННОЙ ВОЙНЕ 1941—1945 гг.“

УДОСТОВЕРЕНИЕ

Стар. сержант Пашаев Камал Скендаревич.

В соответствии с Указом Президиума Верховного Совета СССР награжден юбилейной медалью „Двадцать лет победы в Великой Отечественной войне 1941—1945 гг.“

От имени Президиума Верховного Совета СССР медаль вручена

„60 лет Вооруженных сил СССР“

УДОСТОВЕРЕНИЕ

Пашаев Камал Искендер оглы

В соответствии с Указом Президиума Верховного Совета СССР от 28 января 1978 года награжден юбилейной медалью „60 лет Вооруженных сил СССР“

От имени Президиума Верховного Совета СССР медаль вручена

СВИДЕТЕЛЬСТВО

№ 175054

Тов. Пашаев Камал Искандер оглы

Главным комитетом выставки достижений народного хозяйства СССР

утвержден участником ВДНХ СССР 1968 года

Главвыставком

М. П.

„60 лет Вооруженных сил СССР“

УДОСТОВЕРЕНИЕ

Пашаев Камал Искендер оглы

В соответствии с Указом Президиума Верховного Совета СССР от 28 января 1978 года награжден юбилейной медалью „60 лет Вооруженных сил СССР“

От имени Президиума Верховного Совета СССР медаль вручена

İsgəndər bəy də Iranda mühacirətdə olmuş və orada Qubadlı rayonunun Alyanlı kəndindən göndərilmiş xüsusi agentlər tərəfindən öldürülmüşdür.

İsgəndər bəyin nəsli şəcərəsini davam etdirən Kamal bəy olmuşdur. Kamal bəy Paşayev 1921-ci ildə Laçın rayonunun Qurdqajı kəndində anadan olmuşdur.


„ТРИДЦАТЬ ЛЕТ ПОБЕДЫ В ВЕЛИКОЙ ОТЕЧЕСТВЕННОЙ ВОЙНЕ 1941—1945 гг."

УЧАСТНИКУ ВОЙНЫ

УДОСТОВЕРЕНИЕ

Пашаев Камал Искендер

в соответствии с Указом ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР от 25 апреля 1975 года награжден юбилейной медалью „ТРИДЦАТЬ ЛЕТ ПОБЕДЫ В ВЕЛИКОЙ ОТЕЧЕСТВЕННОЙ ВОЙНЕ 1941—1945 гг."

От имени ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР медаль вручена

„ЗА ДОБЛЕСТНЫЙ ТРУД. В ОЗНАМЕНОВАНИЕ 100-ЛЕТИЯ СО ДНЯ РОЖДЕНИЯ ВЛАДИМИРА ИЛЬИЧА ЛЕНИНА"

УДОСТОВЕРЕНИЕ

Пашаев Камал Искендер оглы

от имени ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР награжден юбилейной медалью „ЗА ДОБЛЕСТНЫЙ ТРУД. В ОЗНАМЕНОВАНИЕ 100-ЛЕТИЯ СО ДНЯ РОЖДЕНИЯ ВЛАДИМИРА ИЛЬИЧА ЛЕНИНА"

„ЗА ПОБЕДУ НАД ГЕРМАНИЕЙ В ВЕЛИКОЙ ОТЕЧЕСТВЕННОЙ ВОЙНЕ 1941—1945 гг."

УДОСТОВЕРЕНИЕ

За участие в Великой Отечественной войне

Пашаев Камал Скендерович

указом ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР от 9 мая 1945 года награжден медалью „ЗА ПОБЕДУ НАД ГЕРМАНИЕЙ В ВЕЛИКОЙ ОТЕЧЕСТВЕННОЙ ВОЙНЕ 1941—1945 гг."

От имени ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР медаль вручена

„50 лет ВООРУЖЕННЫХ СИЛ СССР"

УДОСТОВЕРЕНИЕ

Старшина Пашаев Камал Искендер оглы

в соответствии с Указом ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР от 26 декабря 1967 года награжден юбилейной медалью „50 лет ВООРУЖЕННЫХ СИЛ СССР"

От имени ПРЕЗИДИУМА ВЕРХОВНОГО СОВЕТА СССР медаль вручена

1969 года


УДОСТОВЕРЕНИЕ

ст. сержант

звание

Пашаев

фамилия

Камал

имя

Искендерович

отчество

За доблесть и отвагу в Великой Отечественной войне.

Министр обороны СССР Маршал Советского Союза

А. ГРЕЧКО

1941-ci ildə hərbi xidmətə çağırılmışdır. O, hərbi xidmətdə nümunəvi əsgər olmuş, komandir vəzifəsi daşımış və Böyük Vətən Müharibəsinin iştirakçısı olmuşdur. 1946-cı ildə vətənə qayıtmış və Bərdə rayonunda məskunlaşmışdır. Onun sinəsini  Böyük Vətən Müharibəsinin orden və medalları bəzəmişdir. O əmək cəbhəsində də fədakarlıq göstərmiş və dəfələrlə təltif edilmişdir. Hal-hazırda onun 6 oğlu, (İsgəndər, Aftandil, İsrafil, Rüstəm, Elçin, Laçın) və bir qızı (Ziba) Bərdə rayonunun Qaradəmirçi kəndində yaşayır və nəsil səcərəsini davam etdirirlər.

1941-1945-ci il müharibəsində 3660 Laçınlı iştirak etmişdir ki, onlardan 2426 nəfəri geri qayıtmamışdır. Laçınlı Əvəz Verdiyev  Sovet İttifaqı Qəhramanı adına layiq görülmüş, 34 nəfəri isə Şöhrət ordeni ilə təltif edilmişdir. Belə igid vətən oğlullarından biri də Kamal bəy Paşayev olmuşdur.

## Əmir bəy (1860-)

Paşa bəy qardaşı Əmir bəyi təhsil almaq üçün xaricə göndərir və Əmir bəy meşəçilik üzrə mütəxəssis kimi hazırlanıb vətənə qayıdır. Uzun müddət Laçın rayonunda meşə təsərrüfatı işçisi vəzifəsində çalışmışdır. O rus dilini mükəmməl bilirmiş. Odur ki, Şuşa rayonunda Icraiyyə Komitəsinin sədri vəzifəsində də işləmişdir. Daha sonra Bakıya köçür və mədənçiliklə məşğul olur. Dağ rayonlarında (Laçın, Kəlbəcər və s.) geoloji qazıntılar aparan dəstəyə başçılıq edərmiş.

Əmir bəyin iki oğlu var imiş. Murad bəy (Xanmurad da deyərmişlər ) və Əsəd bəy (Əsəd Sultan).


Мурад Әмирбəj оғлу гызы Нəзакəтлə. 1954-чү ил.

Murad bəyin dörd oğlu olur (Mütalib, Xosrov, Zülfüqar və Əmir). Murad bəyin övladlarının böyüyü Mütalib bəy 1942-ci ildə dünyaya göz açmışdır. İsgəndər bəyin nəvəsi Təzəgül xanımla ailə həyatı qurmuşdur. Hal-hazırda iki oğlu (Şəhriyar, Bəxtiyar) və bir qızı (Vüsalə) vardır.

Zatı zavodu saf olanın özü də saf olur. Atalar gözəl demişdir: "Ot kökü üstə bitər." Tarixdə mərdliyi, cəsarəti, sücaəti, qabiliyyəti və müdrikliyi ilə tanınmış böyük bir nəslin nümayəndəsi olan Mütalib bəy böyük qardaş kimi qardaşları üçün şam kimi yanır, qayğı ilə yaşayır. Ağır itgi olan Xosrovun və Zülfüqarın vaxtsız ölümü onu bərk sarsıdır, odur ki, mən bir dərd dəniziyəm deyir:

Ağlaram ağlar kimi,
Dərdim var dağlar kimi.
Xəzəl olub töküllləm
Viranə bağlar kimi.

Dağlar, maralımı ver,
Səbri qərarımı ver.
Sağ maral sənin olsun
Mənim yaralımı ver.

Bəylik təkcə rütbə kimi hər adama verilmir. Bəy olanın oturuşu, duruşu, yeyişi, gəzişi, danışığı, ümumiyyətlə, bütün xüsusiyyətləri bəy olmalıdır. Xalq arasında belə bir fikir dolaşır ki, bəyin bəyliyi onun bəyliyindən bəlli olur. Bütün bu xüsusiyyətlər Zülfüqar bəydə (hamı onu Zili bəy deyə çağırırmış) cəmləşibmiş. Bu xüsusiyyətləri onu tanıyan bütün insanlar xatırlayır və qələmə alır. Mütalib bəyin

qardaş yanğısı, qardaş itgisindən doğan qardaş iniltisi və sızıltısı “Qardaş” adlı kitabda öz əksini tapmışdır. Bu ağrıya, bu dözülməz ağır itgiyə mən də təəssüf edib, şərik olduğumu bildirirəm və deyirəm ki, Zili təkcə Azərbaycanın deyil Türk dünyasının Zülfüqarı idi. Çox heyf...

1957-ci ildə anadan olmuş Zülfüqar bəy həyatdan çox cavan getmiş və ürəklərə dağ çəkmişdir. Həyatda az yaşasa da mənalı və yaddaqalan iz qoymuşdur. Vətənə namusla qulluq etmiş, ermənilərə qarşı barışmaz mövqedə olmuşdur. Onun iki övladı yarımçıq həyat sinfonyasının işıqlı nurudur. Alah nurlandırsın.






Mən Aşiq özün bilmir,
Danışır, sözün bilmir.
Bulaqdan su götürür
Bulağın gözün bilmir.

# Bayat qəbiləsinin bayatı deyimi, bayatı duyumu

Azərbaycan xalqının formalaşmasında əsas amilə malik olan tayfalardan biri də Bayat tayfası olmuşdur. Həmin tayfanın söylədikləri nəgmələr isə Bayat tayfasının nəgmələri və yaxud “bayatı” adı altında termin kimi formalaşmışdır .M.V.Vidadi roetik dillə onu çox gözəl şəkildə qələmə almışdır:

Külli Qarabağın abu həyatı
Nərmə-nazik bayatıdır, bayatı.

Bayat tayfası Qarabağda ilk insanbirliyinin forması kimi diqqəti cəlb edən və Azərbayjan xalqının etnogenezində iştirak edən əsas tayfalardan biridir. Çünki xalqımızın ən qədim abidəsi olan “Kitabi  Dədə-Qorqud” dastanı Bayat elinin, Bayat obasının, Bayandur xanın hadisələlərini bəyan edir. Heç də təsadüfü deyildir ki, ilk insan məskəni olan Azıx mağarası da Qarabağdadır. Fransız səyyahı və ədibi Aleksandr Düma “Qafqaz səfəri” əsərində Qafqazı bəşəriyyətin beşiyi adlandırmışdır. Deməs Bayat tayfası da bəşəriyyətin beşiyi sayılan Qafqazın qədim tayfalarındandır.

Qarabağ ərazi baxımından dağlar qoynunda yerləşən yaylaq ərazisəinə və aran zonasına ayrılır. Odur ki, Qarabağ aranlı-dağlı cənnətməkan bir diyardır. Biz Qarabağın aranını, yaylağını  ən qədim abidəmiz olan “Kitabi-Dədə Qorqud” dastanından öyrənə bilirik. Ümumiyyətlə Qarabağın sahibi Bayat tayfası olmuşdur. Bu tayfanın nümayəndələrindən biri də Qarabağın dağlıq ərazisində Laçın rayonunda doğulub, yaşayıb yaratmış bayatı ustası Sarı Aşiqdır. Sarı Aşiq bütün yaradıcılıq və bajarığını bayatı canrına həsr etmişdir. Odur ki, onun bayatıları şifahi şəkildə yayılsa da Sarı Aşiqə aid olduğu sənətkarlıq baxımından, deyim, duyum üslubundan, jinas qafiyələrin məna dərinliyi, düzümü, yozumu jəhətindən aşikarlanır. Sarı Aşiq Füzuli qəzəllərinin bayatı dünyasını yaratmışdır. Axı Füzuli də Bayat tayfasındandır. Odur ki, Sarı Aşiqin də bayatıları mirvari dənizi, müdriklik ümmanı və hikmət okeanıdır. Sarı Aşiqin həyat və yaradıcılığı haqqında müəyyən qədər söz deyilmiş, araşdırmalar aparılmışdır. Ona görə də burada ancaq onun rəvayətlərlə bağlı həyat

dünyasından topladığımız bir sıra incilər haqqında söz açarayıq. Belə bayatılar Sarı Aşiqin bilavasitə həyat və fəaliyyəti ilə bağlı olduğundan onun həyatının bəzi məqamlarına aydınlıq gətirir.

Belə söyləyirlər ki, bir gün şiddətli yağış yağırmış və çay daşmışmış. Sarı Aşiq çayı keçib gəlir və paltarı, çarıqları suya batmayır. Camaat bunun sirrini soruşduqda Sarı Aşiq belə söyləyir:

Mən Aşiq bayı keçdim
Kasıbı bayı keçdim
Altı jamış, yüz keçi
Qucaqda çayı keçdim.

Camaat anlayır ki, Sarı Aşiq soyunub paltarını qucağına alıb çayı keçibdir. Burada altı camış dedikdə çarığın altının camış dərisindən olduğu nəzərdə tutulur. Yüz keçi dedikdə isə çarığın üstündən yüz dəfə keçirilən köşə (yəni göndən hazırlanmış bağ) nəzərdə tutulur.

Başqa bir bayatı duyumunda söylənilir ki, bir qız nişanlısının atı üçün çul toxuyur və çulun üstündə yüz dəvə, səksən qatır şəklini də toxuyur. Bir gün bulaqdan su doldurmağa gələn qız nişanlısının atası ilə atı tərkləşmə minib oradan keçdiyini görür və atın belində özü toxuduğu çulu da görür. Ondan soruşurlar ki, buradan keçən o atlı kim idi? O belə deyir:

Mən Aşiqəm bir ata
Bir oğuldu bir ata
Yüz dəvə, səksən qatır
Yüklənibdir, bir ata.

Qız ona görə belə javab verir ki, o dövrdə – nişanlımla atasıydı buradan keçən – deyilməsi müqabil sayılmırdı. Etik normalar buna imkan vermirdi. Həyatın yazılmamış təbii qanunları yazılmış qanunlarından daha möhkəm və işlək olur.

Sarı Aşiq bənövşəli, nərgizli bir talada oğlanla qızın söhbət etdiyini görür. Qız Sarı Aşiqi gördükdə çarşabı ilə oğlanı gizlədir. Bu gördüyü mənzərəni Sarı Aşiq bayatı dili ilə belə söyləyir:

Mən Aşiqəm nərgizlər
Bənövşələr nərgizlər
Ərənləmiş maya gördüm
Qoltuğunda nər gizlər.

Sarı Aşiq ilahi məhəbbətlə sediyi Yaxşının bişirdiyi “Qaşıqaşına” qonaq olur və gedərkən belə bir bayatı söyləyir

Mən Aşiq Qaşıqaşı
Bişirir Qaşıq aşı
Aşıqi yoldan eylər
Yaxşının qaşı, qaşı.

Bütün qızlar həmçinin Yaxşı da elə başa düşürlər ki, Sarı Aşiq Yaxşının bişirdiyi qaşıqaşını tərifləyib, söz qoşmuşdur. Sonradan anlayırlar ki, Sarı Aşiq Yaxşının qaşını vəsf etmişdir. Odur ki, Sarı Aşiq başqa bir vaxtda qızlar toplaşdığı yerə gəldikdə görür ki, qızlar gülüşür. Elə zənn edir ki, qızlar Sarı Aşiqin tezliklə ikinji gəlişinə gülürlər. Odur ki, baxıb görür ki. Yaxşı əlində jad yeyir. (Jad qarğıdalı və yaxud da darı unundan bişirilmiş çörəyə deyiblər) Bu məqamı qeyd etməklə çıxış yolu tapır:

Mən Aşiq bağçada gül
Bağda gül bağçada gül
Aşiqə gülən Yaxşı
Əlində bax jada gül.

Qızlar Sarı Aşiqdən üzr istəyib nəyə güldüklərini izah edirlər.

Sarı Aşiq dostu üçün bir qıza elçi gedir və hə javabı almayınja adətə riayət edərək süfrəyə gətirilmiş çaydan içməyəjəyini söyləyir və bayatı dili ilə belə deyir:

Mən Aşiqəm o çaydan
O, çaynikdi o, çaydan
Bir “hə” sözün deməsən
Billah içmərəm o çaydan.

Qızın atası işin belə məqama çatdığını gördükdə razılıq verir və qanaqlara çayı rahatlıqla içməyi təklif edir. Sarı Aşiq bunu bayatı dili ilə belə söyləyir:

Mən Aşiqəm o çaydan,
O çaynikdi, o, çaydan
Çayı gəlinin süzüb
Doyunca iç o çaydan.

Sarı Aşiq xəbər tutur ki, Yaxşını ondan çəkindirmək üçün taxıl sərgisinə gözətçi təyin ediblər. Odur ki, deyir.

Gəlişin Alıncadan
Xəbər ver Alıncadan
Bir quş yüz bəla çəkər
Sərgidən alınca dən.

Sarı Aşiq gəlib görür ki, Yaxşı bal tasından qablara bal yığır və əlləri bala batıbdı. Odur ki, poetik ilmə çalır:

Mən Aşiq bal tasına
Qarğaram bal tasına
Yaxşının ağ əlləri
Batıbdır bal tasına.

Sarı Aşiq görür ki, bir nəfər çilov-plov yeyir və qarşıdan bir gözəl gəlib keçir. Çilov-plov yeyən hayıl-mayıl qalır. Sarı Aşiq bunu belə qələmə alır:

Mən Aşiqəm çil ovlar
Çil kəkliyi çil ovlar
Burdan bir sona keçdi
Əldə qaldı çilovlar.

Sonra Sarı Aşiq öyrənir ki, buradan sallanıb gedən gözəl nişanlı bir qızdır. Odur ki, belə söyləyir:

Mən Aşiqəm çil ovlar
Çil kəkliyi çil ovlar
Sonanın tərlanı var

Ye, qalmasın çilovlar.

İtirdiyi atını soruşan bir qadına Sarı Aşiq belə javab verir:

Mən Aşiqəm Qəmər hey
Beldə gümüş kəmər hey
Göydə bir madyan doğub
Altda qulun əmər hey.

Sonradan məlum olur ki, Sarı Aşiq qadına dəqiq və sərrast javab veribdi. Belə ki qadının adı Qəmər imiş, belində gümüş kəmər var imiş, itirdiyi at zəmidə taxıl əkilən sahədə (buna göy də deyirlər) doğub, altında isə qulun anasını əmirmiş.

Sarı Aşiq bir qarının qonağı olur və görür ki, evdə kişi olmadığından qarı gəlini gərdəkdən çıxmağa ijazə vermir, bütün işləri özü görür. Son məqamda yorulur və aşı dəmə qoyub gəlini çağırır ki, gəl aşın yağını tök. Gəlinin adı Sarı Aşiq üçün yeni bayatı deyimi söyləməyə imkan verir:

Mən Aşiq gələn yaz,
Gələn payız, gələn yaz,
Aşı  dəmə qoymuşam
Yağın töksün Gələnyaz.

Sarı Aşiq görür ki, zəmidə taxıl biçirlər. Biçinçilərdən kimi dərz bağlayır, kimi penjə tutur, kimi qırpma edir, bir neçəsi isə küləşi odlayıb (köüləş taxılın aşağı hissəsindən yığılan samandır) dəstə – dəstə yığdıqları sünbülləri ütüb, ovub yeyirlər. Buna sütül etmə deyilir. Bu mənzərəni Sarı Aşiq bayatı dili ilə belə təsvir edir:

Qaşıqaşı bişirər
Bilməz naşı bişirər.
Aşiq belə görübdür
Ayaq başı bişirər.

Sarı Aşiq inəyi, buzovu və sağıjını isə belə təsvir  edir:

Mən Aşiq qan ayağı

Qan əli, qan ayağı
Aşiq bir hikmət görüb

Üç başı on ayağı.

Məlumdur ki, Sarı Aşiq haqq aşığı olub, ilahi məhəbbətə tapınıb. Odur ki, evlənməyib və övladı olmayıb. Bunu bilən bir nəfər oğlunu qujağına alır və atıb-tutur. Bununla Sarı Aşiqə sanki yandıq verirmiş. Onun niyətini dərk etən Sarı Aşiq ona qarğıyır:

Oğul oturub qucaqda
Ocaq yanır bucaqda
Fələyin çərxi çönər
Kül də qalmaz ocaqda.

Bu bayatını deyib gedir. Həqiqətən də ojaqdan od düşür ev də, uşaq da yanır. Sarı Aşiq qayıdıb oradan keçəndə həmin evin yanıb külünün göyə sovrulduğunu görür.

Tarixin yaddaş salnaməsi olan nənələr və babalar söyləyirlər ki, Gərəkli adlanan Türk tayfası Laçın rayonunun ərazisinə gəlmişlər. Onlar haqqında xalq arasında deyimlər formalaşıb. Həmin deyimlərdən bir neçəsini diqqətinizə çatdırıram.

Gərəklinin köçün gördüm
İçində bir jüt laçın gördüm
Dörd bir yana, beş bir yana
Doqquz hörük saçın gördüm.

Gərəkli köçdü deyirlər
Yurduna düşdü deyirlər
Gərəklidən qız sevəni
Cənnətə düşdü deyirlər.

Gərəklinin qız qalası,
Ərşə çıxıb ah-nalası,
Ördəynən qaz balası
Göllərdə yalqız olmasın.

Ətimi yeyib, qanımı içən
Namərdə möhtac olmasın.

Belə nəql edirlər ki, Gərəkli tayfasından olan Abdul Paşanın qızı bir oğlanı sevirmiş. Lakin Abdul Paşanın ailəsi öz qızlarını oğlana vermək istəmirmişlər. Odur ki, oğlanla qız xəlvət görüşürmüşlər. Belə görüşlərdən birində oğlan Abdul Paşanın bağında gejə qızla söhbət edir və bir dəli yuxu onu tutur. Başını qızın dizinin üstünə qoyub sanki fil yuxusuna gedir. Qız nə qədər çalışır oğlanı yuxudan oyada bilmir. Odur ki, belə söyləyir:

Sabah olar atlar gələr
Dörd bir yanı otlar gələr.
Tamaşana yadlar gələr
Oğlan, dur get, sabah oldu
Yandı bağrım kabab oldu.

Sabah olar qazlar gələr,
Dörd bir yanı tozlar gələr.
Tamaşana qızlar gələr
Oğlan, dur get, sabah oldu
Yandı bağrım kabab oldu.

Dəyirmanı qoşa-qoşa
Suyu gəlir joşa-joşa
Sənə qurban Abdul Paşa
Oğlan, dur get, sabah oldu
Yandı bağrım kabab oldu.

Qızın səsinə anası bağa gəlir və yatmış oğlanın başını əzib onu öldürür. Səhərisi hay-həşir salıb bir oğlanı öldürüb onların bağına atdıqlarını söyləyir. Yas mərasimində qızla anası da iştirak edirlər. Qız dözə bilməyib ağlayır və belə bir bayatı söyləyir:

Mən Aşiq qanlı dağlar
Qan tutmuş qanlı ağlar.
Yığılıb el ağlaşır
Burada qanlı da ağlar.

Qız görür ki anası təşviş içindədir. Sanki elə zənn edir ki, qızı onun qatil olduğunu açıb söyləyəjəkdir. Qız anasını arxayın salmaq üçün belə söyləyir:

Mən Aşiq qanlı budu
Qan tutmuş qanlı budu
Məni çəksələr dara,
Deməram qanlı budu.

Burada Sarı Aşiqin bayatılarından istifadə məqamları Gərəkli tayfasının XVII əsrdə Laçın rayonunda olmasına bir arayışdır.

Aşağıdakıların yozumunu isə oxucu təxəyyülünün araşdırmasına veririk.

Mən Aşiq ikisinə
İki dil, iki sinə
Bir budaqda beş alma
Gün düşüb ikisinə

Aşiq bir xana gördü,
Zülf üzdə şana gördü.
Səksən oğul, qırx ata,
Əl üzdə ana gördü.

Mən Aşiq ay mələr
Bulud altdan ay mələr
Cəzirədə qoç doğub
Məmə deyin ay mələr.

Mən Aşiq ləngəridi

Sini də ləngəridi
Çox bilib az danışmaq
İgidin ləngəridi.

Mən Aşiq gün düzələ
Gecə yox, gün düzələ
Gecə gödüyüm yuxu
Düşəydi gündüz ələ

**İzi qalmış, sözü qalmış laçınlılar.**

1. Sarı Aşiq – XVII əsdə yaşamış məşhur bayatı ustası.

2. Paşa bəy – Hacısamlı bəyliyinin bünövrəsini qoyan el ağsaqqalı.

3. Sultan bəy – Xalq qəhrəmanı.

4. Xosrov bəy Sultanov – Azərbayjan Demokratik Respublikasının ilk müdafiə naziri, Qarabağın General Qubernatoru, həkim.

5. Nurməmməd bəy Şaxsuvarov - Azərbaycan Demokratik Respublikası dövründə Nazirlər Şurasının sədri, N.Yusifbəylinin II hökumət kabinəsində Maarif və Dini-etiqat naziri, 1920-ji ildə Azərbaycan SSR Xalq Maarif Komissarının müdiri.

6. Museyib İlyasov İbrahim oğlu –Respublikada tanınmış görkəmli maarif xadimi.

7.Xasay Mahmud oğlu Cabbarov – F.e.d., professor.

8. Salman Fərəc oğlu Salahov – Fəlsəfə e.d., professor.

9. Şamil Əmir oğlu Mahmudov – Aviasiya üzrə tex.e.n., polkovnik.

10. Roman Saleh oğlu Səfərəliyev – Tibb e.d., professor.

11. Şirin Fehruz oğlu Məmmədquliyev – Riy.e.n., dosent.

12. Surxay Əzim oğlu Şahsuvarorv – Biologiya e.n.

13. Mürsəl Ədilxan oğlu Şahsuvarorv – Tibb e.d., professor.

14. Cahangir Mirməmməd oğlu Şahsuvarorv – Fizika e.d., professor.

15 Xasay Əliyev - Tarix e.d., professor.

16. Məhəmmədəli Məhərrəmov – Pedaqogika e.n., dosent, Azərbayjanda ilk psixologiya dərsliyinin müəllifi.

17. Vəli Sadiq oğlu Həsənov - Tibb e.n., dosent.

18. Polad Ələsgər oğlu Məmmədov - Tibb e.n.

19. Muğan Azad oğlu Məmmədov – Fizika-riyaziyyat e.n.

20. Məhəmməd Hüseynov – Tarix e.n., dosent.

21. İsmayıl Camal oğlu Sadıqov – Kimya e.n., dosent.

22. İzzət Camal oğlu Sadıqov – Tibb e.n., dosent.

23. İbrahim Saleh oğlu Nəcəfəliyev - Tibb e.n.

24. Malik Fərrux oğlu İbrahimov – Curnalist, şair.
25. Hüseyn Kürdoğlu – Şair, filologiya e.n.
26. Polad Səttar oğlu Qarayev – K/t.e.n.
27. Ənvər Ədil oğlu Heydərov - Tarix e.n., dosent.
28. Cənnət Əhməd oğlu İsgəndərov - Texnika e.n., dosent.
29. Əvəz Verdiyev – Qvardiya baş leytenantı, Polşa torpağında gedən döyüşlərdə Sovet İttifaqı Qəhrəmanı adı almışdır.
30. Muradxan Mahmud oğlu Cabbarov – Uzun müddət Laçın rayonunun rəhbər vəzifələrində işləmişdir.
31. Ağa Laçınlı – şair, filologiya elmlər namizədi.

**Elmi fəaliyyətlərini davam etdirən laçınlı ziyalılar**

1. Şahlar Musa oğlu Muradov – İqtisad e.d., EA-nın muxbir üzvü.
2. Oqtay Bəşir oğlu Əhmədov – Tarix.e.d., professor.
3. Zöhrab İslam oğlu Qarayev – Tibb e.d.
4. Ziyadxan İsrəfil oğlu Nəbiyev - Fizika.e.d., professor.
5. Eldar Məhəmməd oğlu Süleymanov – Texnika e.d.
6. Muxtar Əliş oğlu Həmzəyev - Psixologiya.e.d., professor.
7. Məhəmməd Əhməd oğlu Məhəmmədov---Coğrafiya e. n.
8. Tofiq Surxay oğlu Şahsuvarov – Biologiya-minetologiya e.d., professor.
9. Museyib İbrahim oğlu İlyasov – Pedaqoci e.n.
10. Şirindil Həsən oğlu Alışanov – f.e.n.
11. Mustafa İslam oğlu Qarayev – riy.e.n.
12. Soved Əsəd oğlu Mehdiyev – riy.e.n.
13. Zakir Şəfi oğlu Əliyev – Tibb e.n.
14. Eldar Allahverdi oğlu Əliyev – Tibb e.n.
15. Əvəz Səməd oğlu Zeynalov – Tibb e.n.
16. Köçəri Əkbər oğlu İsmayılov – Tibb e.n.
17. Qəmbər İmamqulu oğlu Əliyev – İqtisad e.n.

18. Natiq Məhyəddin oğlu Mustafayev – Kimya e.n.
19. Rafiq Əbil oğlu Şükürov – Filologiya e.n.
20. Solmaz Səttar qızı Məhərrəmova – Tarix e.n.
21. Kamil Əkbər oğlu Həsənov - İqtisad e.n.
22. Cəmil Zaman oğlu Rüstəmov – Tibb e.n.
23. Malik Hüseyn oğlu Mirzəyev – Coğrafiya e.n.
24. Şükür Məhəmmdəli oğlu Qasımov – Tarix e.n.
25. Vaqif Əmir oğlu Alışanov – Coğrafiya e.n.
26. İnqilab Sultan oğlu Məmmədov – k/t. e.n.
27. İlham Lazım oğlu Kazımov – Tibb e.n.
28. Şahlar İsa oğlu Xəlilov – fiz, riy.e.n.
29. Əli Ağamalı oğlu Qəribov - İqtisad e.n.
30. Miriş Həmid oğlu Hüseynov – kimya e.n.
31. Allahyar Süleyman oğlu İmanov – ped.e.n.
32. Oruc Museyib oğlu Şahsuvarov – Tibb e.n.
33. Sevda Muradxan qızı Cabbarova – fil.e.n.
34. İbrahim Fərrux oğlu Əhmədov – Tibb e.n.
35. Əjdər İbrahimov –Tex.e.n.
36. Sahib Adıgözəl oğlu Zeynalov – fiz, riy.e.n.
37. Zöhrab Əsgər oğlu Məmmədov – Iqtisad e.n.
38. İlham Lazım oğlu Kazımov – Tibb e.n.

**Xalqımızın qan yaddaşı.**

Azərbaycan ərazisi Rusiya və İran tərəfindən işğal olunana qədər təxminən 410 min kv.km olmuşdur. 1828-ci ildə İran və Rusiya dövlətləri Azərbaycanın ərazisini iki hissəyə bölmüş, İran 280 min kv.km, Rusiya isə 130 min kv.km sahəni zəbt etmişdir.

1918-ci ildə Rusiyanın işğalı altında olan Azərbayjan ərazisinin 9 min kv.km-i, yəni İrəvan xanlığı ermənilərə verilmişdir. Həmçinin 7 min kv.km ərazisi olan Dərbənd xanlığı hal-hazırda Rusiyanın əsarətindədir. Rus dövləti hissə-hissə Azərbaycan ərazilərini müxtəlif dövrlərdə Ermənistana, Gürcüstana (Zəngəzur, Göyçə, Şərur, Dərələyəz, Dilican, Borçalı və s.) pay kimi verilmişdir. Bu ərazilərin təxmini sahəsi 27,4 min kv.km-dir.

1991-ci ildə Azərbaycan Rusiyanın əsarətindən xilas olanda Azərbaycanın ərazisi 86,6 min kv.km. idi. Lakin məlum erməni təcavüzü nəticəsində topaqlarımız yenidən işğala məruz qaldı.

| № | İşğal olunan ərazinin adı | İşğal tarixi | Sahəsi |
|---|---|---|---|
| 1. | Dağlıq Qarabağ Muxtar Vilayəti | 1988-1993-cü illər | 4400 kv. km. |
| 2. | Laçın | 18 may 1992 | 1833 kv. km. |
| 3. | Kəlbəcər | 3- 4 aprel 1993 | 1936 kv. km. |
| 4. | Füzuli | 23 avqust 1993 | 1386 kv. km. |
| 5. | Cəbrayıl | 18 avqust 1993 | 1050 kv. km. |
| 6. | Ağdam | 23 iyul 1993 | 1050 kv. km. |
| 7. | Qubadlı | 31 avqust 1993 | 802 kv. km. |
| 8. | Zəngilan | 30 oktyabr 1993 | 707 kv. km. |

Buradan aydın olur ki, 410 min kv. km. əraziyə malik olan Azərbaycanın təzminən 83% ərazisi işğal altındadır. Hal-hazırda biz dədə-baba torpaqlarımızın 17%-nə sahibik. Nə qədər dəhşətli olsa da reallıq belədir.

## Son söz əvəzi.

*Qüdrətdən yanan ocağı heç kəs söndürə bilməz.*

Böyük türk dünyası bir sıra xalqların formalaşmasında (rus, erməni və s.) mənbə olmuşsa da, onu bir başlanğıc od kimi söndürməyə, parçalamağa çalışmışlar. Lakin qüdrətdən yanan ocağı söndürmək mümkün olmadığı kimi böyük türk dünyasını, türkçülük ideologiyasını parçalasalar da, onu məhv etmək, söndürmək mümkün deyildir. Uzun illərdən bəri tüstülənə-tüstülənə tarixə yoldaşlıq edən türk dünyası XXI əsrdə alovlanacaq və əvvəlki mənbə ocağına çevriləcək. Mən buna əminəm. Vaxtilə türklər rusların, ermənilərin soykökünün formalaşmasında az rol oynamamışlar. Biz bünü mərhum professor Ziya Bünyadovun tədqiqatlarında, İlhami Cəfərsoylunun «Türklər rusların soy kökündə» və s. əsərlərdən aydın görə bilərik. Ruslar cəngavərliyi türklərdən öyrənmiş və «baranovlar» mübariz, döyüşkən kimi formalaşmışlar. Bizim xalqımız isə uğurlardan xumarlanmış, uyumuşdur. Bu uyqu Oğuz elinin genindədir. «Oğuz igidlərinə nə bəla gəlsə yuxudan gəlir». Bu eli ayıltmaq lazımdı. Özünə qaytarmaq, soy kökünə tapınmaq, kimi ideyalara səsləmək lazımdır:

Nə yatmısan, qoca vulkan, səninləyəm,
Ayağa dur,Azərbaycan, səninləyəm!

M.Araz.

Bu eli elə ayıltmaq lazımdır ki, din pərdəsi altında qanımızı sormağa, Vətənimizi məhv etməyə, dilimizi əlimizdən almağa daimi meyilli olan tarixi düşmənlərimizi birdəfəlik tanısın. Tanısın ki, - «Qarı düşmən dost olmaz, keçsə də min il».

Bu xalqı elə ayıltmaq lazımdır ki, daim tikan kimi yarağını hazır tutsun. Yarağını hazır tutsun ki, gülü, Azərbaycan kimi cənnət məkanı əlində saxlaya bilsin.

Nəhayət bu milləti elə ayıltmaq lazımdır ki, soy kökünü unutmasın və tarixin daş yaddaşında əbədi yaşaya bilsin. Bu hüququ bizə heç kim pay verməyəcək, bunu özümüz, hər birimiz qazanmalıyıq. Təsadüfi deyildir ki, sərkərdə igid

babamızın adı da Qazan olmuşdur. Bu adın leksik anlamı da bir daha bizi soykök hüququmuzu qazanmağa səsləyir. Odur ki, az da olsa burada Azərbaycana və milli dəyərlərimizə qarşı yönəlmiş hər bir ideologiyanın aşkarlanmasına çalışıb, düşmənin iyrənc xüsusiyyətlərini bəşər övladının diqqətinə çatdırmaqla xalqımızın əzildiyini, torpaqlarımızın işğal olunduğunu bir daha gündəmə gətirmişik. Bununla da qan yaddaşımızın silinməməsinə çalışıb, düşməndən intiqam və qisas almaq üçün xalqımızı və eləcə də bütün türk dünyasını mübarizəyə səsləyirik.

Bizim bədbəxtliyimiz ondadır ki, uzun illərdən bəri talanqarət olunub, işgəncələrə məruz qaldığımızı dərk etmirik. Biz bunu dərk etməli və bütün fəaliyyət sahələrində ağır dərdlərimizi əks etdirib dünya miqyası səviyyəsində təbliğ etməliyik. Əzildiyimizi, talanqarət olunduğumuzu əks etdirməkdən çəkinməməliyik, biz bunu qeyrətsizlik sanmamalıyıq. Biz bunu ona görə belə etməliyik ki, mübarizə ruhumuz artsın, bizdə düşmənə qarşı barışmaz ruh formalaşsın, yaddaşsızlıq bəlamıza son qoyulsun.

Biz Nəsiminin dönməzliyini, igidliyini deyil, ona edilən zülmün dərəcəsini, işgəncənin ölçüyə sığmazlığını təbliğ etməliyik. Çünki dözümlülük, səbirli olmaq ideyasının təbliği köləlik fəlsəfəsindən irəli gələn haldır. Xeyir elə həmişə xeyirdir, işin şər başını fikirləşmək lazımdır. Qoy bizim qəhrəmanlığımızı başqaları söyləsin, biz özümüz özümüzü təriflədiyimiz bəsdir. Necə ki, biz nə qədər əzilir, döyülürüksə də qəhrəmanıq deyirik. Gör necə qəhrəmanıq ki, ermənilər Qarabağda at oynadır, biz isə moizə oxuyuruq.

**İstifadə olunmuş ədəbiyyat.**

1. . ASE (IX cild), Bakı-1987.
2. «Açıq fikir» qəzeti, 20-26 yanvar, 2000-ci il.
3. Ayna Uşaq Ensklopediyası «Tarix keçmişdən gələcəyə», Bakı-2004.
4. Ə.Fərzəli «Dədə Qorqud yurdu», Bakı-1989.
5. F.İsmayılov «Tarixin faciəsi Laçın», Bakı-2003.
6. Həvva Məmmədova «Qarabağ General Qubeonatorluğunun erməni təcavüzənə qarşı mübarizə tarixindən səhifələr», Bakı-1999.
7. İ.Cəfərsoylu «Türklər rusların soykökündə», Bakı-1995.
8. İ.Cəfərsoylu «Tarixi-etimoloji təhlilin köməyi ilə Qarabağ etnonimlərinin tədrisi», Bakı-1991.
9. «Qarabağnamələr» (I, II cild) Bakı-1989, 1991.
10. M.Seyidov «Azərbaycan xalqının soykökünü düşünərkən», Bakı-1989.
11. M.Kalankatuklu «Albaniya tarixi», Bakı-1993
12. M.R.Musayev, M.H.Mirzəyev «Türk dünyası», Bakı-2004.
13. M.Cabbarov «Mənim Laçınım» Bakı-1995.
14. Ş.Fərzəliyev «Azərbaycan XV-XVI əsrlərdə».
15. Y.B.Yusifov, S.K.Kərimov «Toponimikanın əsasları», Bakı-1987.
16. N.Kərimov, «Qırx il səyahətdə», Bakı-1977.
17. “Kitabi-Dədə Qorqud” Bakı, 1962.
18. M. Seyidov. Azərbaycan xalqının soykökünü düşünərkən,
19. Vidadi İsayev. Burdan bir köç keçdi, Bakı,

## Kitabın içindəkilər



**Əliyev Əli Umud oğlu** 1954-cü ilin 26 noyabrda Laçın rayonunun Ərikli kəndində anadan olmuşdur. 1972-ci ildə orta məktəbi bitirib Xankəndi Pedoqoji İnstutuna qəbul olmuşdur. 1976-cı ildə instutu bitirib doğulduğu Ərikli kəndində öz ixtisası üzrə Azərbaycan dili və ədəbiyyatı fənnindən dərs deməklə əmək fəaliyyətinə başlamışdır. 1991-ci ildən 2000-ci ilə kimi N.Tusi adına ADPU-nin Şuşa filalında baş müəllim vəzifəsində fəaliyyət göstərmişdir. 2001-ci ildən hal-hazıra kimi Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi filialında baş müəllim işləyir.

Azərbaycan Elmlər Akademiyası, Nizami adına Ədəbiyyat İnstututunun dissertantıdır. "Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsəri" mövzusunda yazdığı dissertasiyasını müdafiə üçün müzakirəyə təqdim etmişdir. "Mir Möhsün Nəvvabın əsərlərinin nəşri və tədqiqi tarixindən" (Bakı 1997) kitabının müəlliflərindən biridir. Onun aşağıdakı çap olunmuş elmi və metodiki məqalələri vardır:

"Səməd Vurğun və klassik irsimiz" ("Laçın" qəzeti, 22-VI-1976")

"Ayın tarixi" (Azərbaycan dili və ədəbiyyatı tədris jurnalı, Bakı-1987, № 2)

"Sarı Aşiqin bayatıları" ("Laçın" qəzeti 27-II-1988)

"Tarixin yaddaş salnaməsi" ("Laçın" qəzeti, 22XI-1991)

"Mir Möhsün Nəvvab" ("Laçın" qəzeti22-XI-1990)

"Ailə tərbiyəsi əsasdır" ("Laçın" qəzeti, 11-X-1990)

"Mir Möhsün Nəvvab və Fatma xanım Kəminə arasında müaşirə" ("Şuşa" qəzeti, 25-IV-1991)

Nizami 850 "Mənəvi xəzinə kamalın loğmanı" ("Şuşa" qəzeti, 13-XI-1991)

"Şölə saçan incilər" ("Şuşa qəzeti, 30-X-1991)

"Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvab" ("Yeni dünya" qəzeti 10-XI-1995)

Füzuli 500 "Yanğıya dönən haray" ("Aran" qəzeti, 9-IV-1995)

"Qrammatika dil yaratmır" ("Maarifçi" qəzeti, 10-VI-1998)

"Kitabi – Dədə - Qorqud" Azərbaycan xalqının qədim tarixi, söz hörgüsü və sərvətlər muzeyidir" ("Haqqın səsi" qəzeti, 01-IX-1998)

"Xalq anlamı, bayatı duyumu". ("Gənclik" qəzeti, 28-V-2000)

"Qarabağ ədəbi məclisləri" (" Xankəndi Pedoqoji İnstutu" kitabı, Bakı-2000)

Nəsrəddin Tusi – 800 "Elm ölkəsinin şahı", ("Gənclik " qəzeti, 11-II -2001)

"Daş(qaya) onqonu haqqında", ("Gənclik " qəzeti, 25-VI-2001)

"Ünsiyyətin görünməyən amilləri", ("Əsərlər toplusu" kitabı, Gəncə 2002)

"Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsəri" (Pedaqoji "Universitet xəbərləri" № 2 Bakı 2002)

"Mir Möhsün Nəvvabın çoxşaxəli fəaliyyətinin bəzi cəhətləri". ("Pedaqoji tədqiqatlar", Elmi Məqalələr məcmuəsi), № 1 (23), Bakı 2005)

"Təzkireyi-Nəvvab"da müəllif şeirləri, (Elmi axtarışlar, Bakı "Səda 2006)

"Mir Möhsüm Nəvabbın Maarifçilik fəaliyyəti"( Filologiya məsələləri, № 5 Bakı 2007)

"Mir Möhsün Nəvvab və klassik irsimiz", (El sözü, 2007, № 1- 2)

"Klassik təzgirəçilik ənənəsi və M.M.Nəvabbın " Təzkireyi Nəvvab" əsəri". (ADPU- nun xəbərləri. Bakı № 1, 2008)

"Hüseyin Cavid XX əsr Azərbaycan romantizmin tarixi taleyidir", (" Azad Hüquqşünas" qəzeti, 26. 11. 2008)

"Oğuz yurdu- Oymaqlar, Avşar eli", ("Həqiqəti və reallıq" qəzeti, 30.05. 2009)

"Qarabağın qara günləri" haqqında düşüncələr, ("Yurd həsrəti qəzeti, 18. 05-10. 06- 2009)

"Qarabağ ədəbi mühitinin təşəkkülü və formalaşması", (Azad hüquqşünas qəzeti, 16. 05, 2009)

**Əli Əliyev**

# Laçın – Qədim Oğuz Yurdu

**(Zəngəzurun Mağoğuz bölgəsi üzrə**
**Hacısamlı bəyliyi və bir nəsilin səcərəsi)**

*Korrektor:* **Sona Abbasəliqızı**
*Dizayn:* **Dönməz Q. Müşlanlı**

Yığılmağa verilmişdir: 12.06.2009
Çapa imzalanmışdır: 30.07.2009
Nəşrin forması: 60X90 1/16
Fiziki çap vərəqi: 7
Tiraj: 300 nüsxə